reporting to others. 2. Exploring opportunities involves gathering information about existing opportunities within but also outside organizations (training and other development methods). 3. Making decisions and setting goals on short and long term for training requirements, change of job / department etc. 4. Planning consists of determining ways and means of achieving goals, ordering their actions to achieve them, considering its consequences, setting deadlines and resource requirements. 5. Pursuit of achivement goals, action by the individual accounts for his successes and failures and make decisions to retain or change career course. Individual perspective on career (Chartered Institute of Personnel and Development – CIPD, 2005) is determined by the status of the individual professional and personal life, age, family circumstances, financial expectations, desired lifestyle, etc. Some individuals are hoping to be promoted to a senior position within an organization, others want to take a new job in another organization, accepting new and different responsibilities by investing in developing new skills and acquiring new abillities, reducing or increasing the number of work hours, or looking for jobs with a flexible working schedule (Yiu, 2022).

## Conclusion

According to the article career planning initiatives among university and college students stand as pivotal mechanisms for equipping individuals with the essential skills and direction needed to navigate their professional journeys. Everyone who wishes to succeed in the corporate world should plan their career. It should not be forgotten that time, work and planning are the main conditions for a good career. Planning one's career is something that every working person should occasionally consider. This can be caused by the necessity to decide on a new job path or by having to plan the steps required to advance in one's current field of employment. By becoming independent of others and learning to adapt to changing circumstances, the objective here is to grow as a person and create your future. Career planning is based, therefore, on the evaluation of individual skills, interests and motivation, on the analysis of organizational opportunities, setting goals for their careers and develop a strategy to achieve those goals.

## References

1. Manovich, L. (2002). *The Language of New Media.* Massachusetts Institute of Technology.
2. Yerlikaya, A., Kanishli, E., & Bozdoghan, D. (2020). Career Application and Research Centers in Universities: Black Sea Region. *TOGU Career Research Journal,* 16-23.
3. Yiu, Z. (2022). *Research on the Guidance of Volunteering for Senior High School Students Under the Perspective of Career Planning*. Hebei Normal University.
4. Akgemişli, T., Şərif, Ş. və Çelik, A. (2004). *Karyera idarəetmə*. Qazi Nəşrləri.
5. Aytaç, S. (2009). İş həyatında karyera idarəetmə. A. Yelboğa (red.). *İdarəetmədə insan resursları araşdırmaları.* Turhan Kitabevi.
6. Benligiray, S. (2006). *İnsan resurslarının idarə edilməsi*. Nisan Kitabevi.
7. Kızılıoğlu, S. D. (2012). *İnsan resurslarının idarə edilməsi üzrə işə qəbul*. Magistrlik dissertasiyası.
8. Rzayev, P. (2014). *Müəssisə və təşkilatlarda heyətin idarəedilməsinin aktual problemləri.*

Received: 14.08.2024
Revised: 20.09.2024
Accepted: 07.10.2024
Published: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/19-24

**Təhminə Əliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universitetin Quba filialı
tarix üzrə fəlsəfə doktoru
tehmine.eliyeva@quba.adpu.edu.az
https://orcid.org/0009-0001-2520-4371

# Visbaden toplantısından Münhen sövdələşməsinə Azərbaycan mühacirəti

**Xülasə**

XX əsrin 20-ci illərində qurulan Sovet hakimiyyəti istilaya məruz qoyduğu xalqlarla yanaşı, Rusiya içərilərində yeni rejimlə ayaqlaşmaq istəməyən siyasi xadimlərin mühacirət dövrü başladı. Həmin siyasi mühacirlər Avropanın müxtəlif ölkələrində məskunlaşaraq öz ölkələrinin azadlığı naminə mübarizəni davam etdirdilər.

Bu dövrdə birikdə mübarizə üçün birləşən Qafqaz siyasi mühacirlərindən və Rusiya mühacirlərindən bəziləri Visbaden, Münhen və digər görüşlər keçirmiş, müəyyən razılıqlara gələrək birlikdə mübarizəyə qərar vermişdilər. Lakin bu birliyə qoşulmayan digər mühacirlərin bu razılaşmalarda olan asılılıq siyasətinə qarşı çıxması mühacirlər arasında uçurum yaradacaq fikir ayrılıqları yaratmışdır.

***Açar sözlər:*** *mühacirət, Rusiya, Azərbaycan, Gürcüstan, Türküstan, Münhen*

**Tahmina Aliyeva**
Guba branch of Azerbaijan State Pedagogical University
Doctor of Philosophy in History
tehmine.eliyeva@quba.adpu.edu.az
https://orcid.org/0009-0001-2520-4371

# Azerbaijan Emigration From the Wiesbaden Meeting to the Munich Agreement

**Abstract**

In the 20s of the XX century, the period of emigration of political figures who did not want to keep up with the new regime began, along with the peoples invaded by the Soviet power. Those political emigrants settled in different countries of Europe and continued to fight for the freedom of their countries.

During this period, some of the Caucasian political emigrants and some of the Russian emigrants, who united to fight together, held meetings in Wiesbaden, Munich and other places, reached certain agreements and decided to fight together. However, the opposition of other immigrants who did not join this union to the dependency policy contained in these agreements created differences of opinion that would create a gap between the immigrants.

***Keyword:*** *emigration, Russia, Azerbaijan, Georgia, Turkestan, Munich*

## Giriş

XX əsrin 20-ci illərində Sovet hakimiyyətinin qurulması ilə bir çox xalq və siyasi xadimlər üçün çətin bir dövr başladı. Sovet rejiminin təsiri altında olan xalqlar, xüsusən də Qafqaz və digər ərazilərdə yaşayanlar, yeni hökumətin totalitar siyasətinə qarşı çıxaraq mübarizə aparmaq məcburiyyətində qaldılar. Sovet işğalından qaçan bir çox siyasi lider və ziyalılar ölkələrini tərk edərək Avropada mühacirət həyatı yaşamağa başladı.

Bu mühacirlər əsasən Avropa ölkələrində, xüsusən də Almaniya, Fransa və Polşa kimi ölkələrdə məskunlaşdılar. Mühacirətdə olsalar da, onlar öz ölkələrinin müstəqilliyi və azadlığı uğrunda müba

rizələrini davam etdirmək niyyətində idilər. Qafqaz siyasi mühacirləri arasında bir çox tanınmış şəxslər bir araya gələrək, müstəqillik üçün birgə hərəkət etməyin zəruriliyini anlayaraq müxtəlif toplantılar və görüşlər təşkil edirdilər. Visbaden və Münhendə keçirilən görüşlər bu baxımdan əhəmiyyətli idi. Bu görüşlərdə əsas məqsəd Rusiya imperiyasının təsirindən çıxmaq və Qafqazda müstəqillik ideyasını genişləndirmək üçün birlik yaratmaq idi (“Azərbaycan” jurnalı, 1991, s. 125).

**Tədqiqat**

Lakin bu dövrdə siyasi mühacir hərəkatında bir çox fikir ayrılıqları da meydana çıxdı. Müxtəlif millətlərdən olan mühacirlər arasında ortaq bir strategiya tapmaq çətin olurdu. Visbaden və Münhen görüşlərində əldə edilən razılaşmalar bəzi mühacirləri bir araya gətirsə də, digərləri bu ittifaqa qoşulmaqdan imtina etdilər. Mühacirlər arasında yaranan bu fikir ayrılıqları zamanla daha da dərinləşdi və bir çoxları mübarizəni fərqli yollarla davam etdirməyə çalışdı. Nəticədə, Qafqazın azadlığı üçün mühacirət dövründə başlayan birlik cəhdləri tamamilə uğurlu olmadı, çünki ortaq məqsəd olsa da, ona çatmaq yolları barəsində ciddi mübahisələr mövcud idi.

Mühacir həyatı yaşayan tək Qafqaz xalqları deyildi, eyni zamanda sovet hakimiyyəti qurulduqdan sonra Rusiyada əvvəl yaradılmış müvvəqqəti hökümətin bəzi müxalif ünsürləri də bu cür təşkilatlanmalar yaradaraq öz siyasi fəaliyyətini Avropada davam etdirirdilər. 1951-ci ilin avqust ayında Almaniyanın Münhen şəhərində nəşrə başlanan Kafkas komitəsinin mətbu orqanı olan “Kafkasya” jurnalı 1920-ci il istilasından sonra öz doğma vətənlərini tərk edib, mühacirət etmiş qafqazlıların toplaşdığı, qafqazın tarixi keçmişi, cari hadisələrin müzakirə edildiyi bir siyasi tarixi ictimai bir jurnal idi.

1951-ci il noyabrın 7-də Qərbi Almaniyanın Visbaden şəhərində keçirilmiş konfransda Rusiya Xalqlarının Qurtuluş Şurasını daha geniş cəbhəyə çevirmək haqqında qərar qəbul edilmişdi. Bu qərar əsasında bəzi rus və qeyri-rus mühacir təşkilatları 1952-ci ilin oktyabrında Antibolşevik Mübarizəsinin Koordinasiya Mərkəzini yaratdılar. Bu mərkəzin yaradılması barədə razılaşmaya Azərbaycan Milli Birlik Məclisi adından Ceyhun Hacıbəyli, Əkbər ağa Şeyxülislam və Cahangir Kazımbəy imza atmışdılar. Lakin Koordinasiya Mərkəzindəki daxili ixtilaflar nəticəsində 1952-ci ilin dekabr ayında Azərbaycan və Gürcüstan nümayəndələri mərkəzin tərkibindən çıxdılar. 1953-cü ildə təşkilat iki yerə parçalandı və nəticədə, formalaşan qurumların hər biri ayrılıqda öz Koordinasiya Mərkəzlərini yaratdı. A. Kerenskinin və S. Melqunovun başçılıq etdiyi birinci Koordinasiya Mərkəzinə yalnız rus təşkilatları və bir qeyri-rus təşkilatı – “Hürriyyət uğrunda savaşan Erməni Birliyi” daxil oldu. Azərbaycan Milli Birlik Məclisi isə digər qeyri-rus təşkilatları ilə birgə ikinci Koordinasiya Mərkəzində təmsil olunmuşdu. Bu vəziyyət, Ə. Fətəlibəyli-Düdənginskinin rəhbərlik etdiyi Azərbaycan Milli Birlik Məclisinin vaxtilə rus mühacir təşkilatları ilə işbirliyi qurma taktikasının yanlış olduğunu göstərdi (Hacıbəyli, 1952). Amerikan Komitəsinin iki Koordinasiya Mərkəzini barışdırmaq və bir araya gətirmək cəhdləri uğursuzluqla nəticələndi və nəticədə onların maliyyələşdirilməsi dayandırıldı. Beləliklə, Koordinasiya Mərkəzləri fəaliyyətlərini dayandırdılar. Füssen, Ştutqart, Visbaden və Starnberq konqreslərində qəbul edilən qərarlar nəticəsində Münhen konqresində Rusiya millətlərinin qurtuluşu üçün vahid siyasi mərkəz yaradılması məqsədilə addımlar atıldı. Bu konqreslərdə iştirak edən rus siyasi partiyaları millətlər məsələsinin bolşevizmin tam məhvindən sonra Rusiya vəhdətinin mühafizəsi şərti ilə Rusiya Müəssislər Məclisi tərəfindən həll edilməsi lüzumunda razılığa gəlmişdilər. Ştutqart konqresində isə Rusiya millətlərinin təyini-müqəddərat haqqı tanınmış, lakin Rusiya torpaqlarının balkanlaşmasının bütün Rusiya millətlərinin mənfəətinə uyğun olmadığı bəyan edilmişdir. Visbaden konqresində isə Rusiya xalqlarının bərabər və sərbəst olaraq demokratik əsaslarda referendum yolu ilə öz müqəddəratlarını təyin etmək haqqı tanınmışdır. Münhen bəyannaməsi ilə Koordinasiya Mərkəzinə daxil olmuş qeyri-rus qruplar milli dövlətlərindən bəhs etməmək öhdəliyi altına girmişdilər. Bu, rus imperializminin gizli şəkildə davam etdiyini göstərirdi. Nizamnamənin təşkilat əsaslarına görə, Koordinasiya Mərkəzində ruslar bütün qeyri-rusların sayı qədər üzv olmaq hüququna malik idilər, bu isə millətlərə "bərabərlik" haqqının əsassız olduğunu sübut edirdi. Münhen bəyannaməsini Azərbaycan Milli Birlik Komitəsi adından Ceyhun Hacıbəyli, Şeyxülislam və Kazımbəy imzalamışdılar. Bu şəxslər nə Visbadendə, nə də Münhendə Azərbaycan türkünün onlara həvalə etdiyi müqəddəs səlahiyyətləri millətinin əleyhinə olaraq pisliyə əl atmaqda tərəddüd etməmişdilər.

Koordinasiya Mərkəzinin təşkilini rus partiyaları üçün ciddi milli təşkilatlar qarşısında bir məğlubiyyət kimi təsvir etmək olar. Heç bir ciddi qeyri-rus təşkilatın bu mərkəzdə iştirak etməməsi rus imperializminin istiqlalçı milli qüvvələr qarşısında tam məğlubiyyətini göstərirdi. Visbaden konfransında iştirak edən Azərbaycan nümayəndələri "Azərbaycan" adlı bir jurnal nəşr etdirməyə başladılar.

Şimali Qafqaz nümayəndələri isə "Hür Kafkasya" adlı məcmuə dərc etdirdilər. "Azərbaycanlıların etirazı" adlı məqalədə 21 noyabr 1951-ci ildə Ankarada Dr. H. Atamanın riyasəti və mühəndis İsmayıl Sarıyelin katibliyi ilə Azərbaycan koloniyasının öndə gələn bir sıra şəxslərinin bir araya toplanması və məlum toplantı ilə bağlı iclas keçirdikləri, həmin iclasda Məmməd Əmin Rəsulzadənin hesabatının dinlənildiyi bildirilmişdir. Həmin məruzənin bir neçə abzası da jurnalda dərc olunmuşdur. Hesabatda, Velikorus partiyaları tərəfindən Stutqard şəhərində qəbul olunan qərarlara qarşı Azərbaycan mühacirlərinin etirazları ifadə edilmişdir.

1951-ci il noyabrın 7-də Qərbi Almaniyanın Visbaden şəhərində beş mühacir rus təşkilatlarının (1. "Rusiyanın Hürriyyəti üçün Mücadilə Birliyi". 2. "Milli mək Birliyi". 3. "Rus Xalq Hərəkatı". 4. "Xalqın Hürriyyəti üçün Mücadilə Məmiyyəti". 5. "Rusiya Xalqlarının Qurtuluşu üçün Mücadilə Birliyi") və beş də rus olmayan millətlərə mənsub təşkilatların nümayəndələrinin iştirakı ilə konfrans keçirildi. Konfransda ukraynalıların və gürcülərin, türküstanlıların, şimali qafqazlıların tanınmış adamları iştirak etmişdi (Yaqublu, 2018, s. 34).

Azərbaycan nümayəndəsi kimi həmin iclasda "Azərbaycan Milli Birlik Məclisi" adlı bir təşkilatın üzvləri Ceyhun Hacıbəyli, Əkbər Ağa Şeyxüslamov və İsmayıl Əkbər, Türküstan nümayəndəsi kimi "Türk ili" komitəsinin təmsilçiləri olan K. Kanatbay və D. Tageberli, Gürsütan nümayəndəsi kimi "Gürcü Milli Şurası" (Bu partiya 12 oktyabr 1951-ci ildə qurulmuşdur. – T. Ə) Şimali Qafqaz adından "Şimali Qafqaziya Bolşevik əlehdarı milli Birliyi" kimi Abdurrəhman Avtorhanov (Kunta) iştirak etmişdir ("Kafkasya" junalı, 1951, s. 40-46). Bu iclasda qəbul olunan bəyannamə 3 maddədən ibarət olmuşdur:

- Qeyri-rus millətlərin mübarizəsi "Rusiyanın daxili işi" elan olunmuşdur.
- Beləliklə, faktiki olaraq rus mühacir təşkilatlarının təkid etdiyi "vahid, bölünməz Rusiya" prinsipi təsbit olunur
- SSRİ-nin süqutundan sonra qeyri-rus millətlərin öz müqəddəratını təyin etməsi gələcəkdə çağrılacaq Rusiya Müəssislər Məclisinin öhdəsinə buraxılırdı (Cabbarov, 2018, s. 64).

Kafkasya jurnalının materilalarından məlum olur ki, keçirilən iclas "Rusiya Millətlərini Qurtarma şurası" tərəfindən rus olmayan millətlərlə böyük və bölünnməz Rusiya yatarmaq bir sıra məsələləri öz aralarında həll etməkdən ibarətdir. Bu qərar digər siyasi mübarizlər tərəfindən qəti etirazlara səbəb olur və qərarı qəbul edən Qafqaz mühacirlərinin xəyanəti kimi qəbul edilir. Beləliklə, bu konfransdan sonra qərbdə yaşayan mühacirlər arasında qəti olaraq iki fərqli siyasi düşüncənin mövcud olduğu açıq aşkar görülür.

İclasın keçirilməsindən sonra Azərbaycan Gürcüstan və Türküstanın mühacirətdə yaşayan nümayəndələri öz təmsil etdikləri təşkilatlarının adından bu toplantıya qarsı qəti və kollektiv şəkildə etirazlarını bildirdilər. Kollektiv imzalarla bəyannamədəki şərtlərin qəbulunun qeyri-mümkünlüyünü bildirir.

"Kafkasya" jurnalının 4-5 sayında "Visbaden toplantısı münasibəti ilə başlığı altında" Azərbaycan mühacirləri tərəfindən azərbaycanlıların etirazı, gürcülərin etirazı nəşr olunmuşdur.

Visbaden konfransında istirak etmiş Azərbaycan nümayəndələri yaratdıqları təşkilatın adından "Azərbaycan" adlı bir jurnal nəşr etdirməyə başlayır. Şimali Qafqaz nümayəndələri isə yaratmış olduqları təşkilat adından "Hür Kafkasya" adlı məcmuə dərc etdirirlər.

"Azərbaycan" dərgisi haqqında M. Kəngərli tərəfindən A. Düdənskinin "Hesabı"na dair" adlı məqaləsində 1951-ci ildə ay göstərilmədən nəşr olunan "Azərbaycan" dərgisinin yarısı türk, yarısının rus dilində çap olunduğunu öyrənirik.

1951-ci il tarixində toplanan Füssen konqresində iştirak etmiş rus partiyalarının hamısı (Rusiya Xalqlarının Qurtuluşu Uğrunda Mücadilə İttifaqı xaric) millətlər məsələsinin bolşevizmin tam

məhvindən sonra Rusiya vəhdətinin mühafizəsi şərti ilə Rusiya Müəssislər Məclisi tərəfindən həll edilməsi lüzumunda razılığa gəlmişlər.

19 avqust 1951-ci il tarixində toplanan Ştutqart konqresində iştirak etmiş bütün rus partiyaları isə millətlər məsələsində Rusiyanın Hürriyyəti Uğrunda Mücadilə İttifaqı Partiyasının aşağıdakı fikrini mənimsəmiş bulunurdular:

"...Konqresdə iştirak edən rus siyasi partiyaları Rusiya millətlərindən hər birisinin təyini-müqəddərat haqqını tanıyır, bu millətlər də Rusiyanın parçalanmasının, siyasi, iqtisadi və mədəni mənfəətlərinin əksinə qane olurlar... Rusiya torpaqlarının balkanlaşması istisnasız olaraq bütün Rusiya millətlərinin mənfəətinə uyğun deyildir. Bu hal həmin millətlər arasındakı həyati əhəmiyyətli mədəni və iqtisadi əlaqələrin sarsılmasına gətirib çıxaracaq, bundan başqa dəfələrlə qanlı qardaş qırğınları şəklində təzahür edəcək daimi münaqişələr doğuracaqdır. Bunun üçün də istisnasız olaraq bu millətlərin mənfəətlərinə uyğun olacaq yeganə doğru yol Rusiyanın parçalanması deyil, federasiya və milli-mədəni muxtariyyət əsasında, azad Rusiya millətlər ailəsi vəhdətinin mühafizəsidir" ("Rus demokratı" məcmuəsi, 1951, s. 2).

Ştutqart konqresinin ardınca 7 noyabr 1951-ci il tarixində toplaşmış bədnam Visbaden konqresinə təcili uydurulmuş "milli" təşkilatların nümayəndələri də qatıldığından dəfələrlə "Kafkasya" sütunlarında təmas edildiyinə rəğmən, bu konqresdə millətlər məsələsinə dair qəbul olunmuş qərarları qısaca da olsa, burada xülasə etməyi faydalı görürük. Qərar budur:

"...Rusiya xalqlarının bərabər və sərbəst olaraq demokratik əsaslarda referendum yolu ilə öz müqəddəratlarını təyin etmək haqqı tanınır. Belə bir təyini-müqəddərat haqqı Rusiyada kommunist diktaturasının tam süqutundan sonra ya plebissit, ya da Milli Müəssislər Məclisi və ya Ümumrusiya Müəssislər Məclisində alınacaq qərarlarla gerçəkləşəcəkdir".

Beləliklə, bu görüş Koordinasiya Mərkəzi nizamnaməsinin siyasi platforma hissəsinin 3-cü maddəsində də millətlər məsələsinin əsası olaraq eynilə mühafizə edilir. Bu maddənin 3-cü qeydi xüsusilə diqqətə layiqdir.

Burada Sovetlər Birliyi xalqlarının qurtuluşu üçün mücadilə orqanı olduğu bildirilən Koordinasiya Mərkəzinin bütün mühacirəti birləşdirmədiyi qeyd edildikdən sonra bu mərkəzə daxil olan rus təşkilatlarının özlərini gələcək rus hökumətinin nüvəsi olaraq qəbul etmədikləri bildirilir. Bununla birlikdə Koordinasiya Mərkəzinə daxil qeyri-rus təşkilatları da özlərini təşəkkül etmiş müstəqil milli dövlətlərin təmsilçiləri adlandırmırlar.

Zahirən Koordinasiya Mərkəzinə daxil olan rusların qeyri-ruslara doğru atılmış bir addım kimi görünən bu qeydin həqiqətdə qeyri-rusların boğazına sarılmış rus imperializminin bu dəfə daha gizli şəkildə yıxıcı rol oynadığını görmək çətin deyil. Nizamnaməni imzalamış rus partiyalarının gələcək rus hökumətinin nüvəsini təşkil etmədiklərini qəbul etmələri təbii bir haldır və belə bir öhdəlik onları təşəkkül etmiş bir Rusiya dövlətinin təmsilçiləri ola bilmək haqqından və imkanlardan heç də məhrum etmir. Qeyri-rus təşkilatlarına gəlincə, bədnam qeyd bunların üzərinə təşəkkül etmiş milli dövlətlərini inkar edərək bundan heç bəhs etməmək öhdəliyini qoyur ("Rus demokratı" məcmuəsi, 1951).

Münhen bəyannaməsi ilə Koordinasiya Mərkəzinə daxil olmuş qeyri-rus qrupların belə bir öhdəlik altına girmələrinin rus partiyaları üçün necə böyük əhəmiyyət ifadə etdiyini bəyannaməni imzalayanlardan A. Mixaylovskinin bu münasibətlə yazdığı və "Russkaya ideya" qəzetinin eyni sayında dərc etdirdiyi bir məqaləsindən bərabər izləyək:

A.Mixaylovski qeyri-ruslara təşəkkül etmiş milli dövlətlərindən bəhs etməmək öhdəliyini qoyan bədnam 3-cü maddənin 3-cü qeydini eyni ilə təkrarladıqdan və eyni zamanda gələcəkdə mərkəzə daxil olacaq digər qeyri-rus təşkilatların da bu prinsipləri tamamilə qəbul etmələrinin vacibliyini xeyli təriflədikdən sonra davam edir:

"....Başqa sözlə bu, Koordinasiya Mərkəzi nizamnaməsinin Sovetlər Birliyində kommunist diktaturasının tam süqutu və buradakı millətlərin öz müqəddəratı və Rusiya ilə gələcək münasibətləri haqqında bir qərar verincəyə qədər ümumrusiya mübarizəsi sıralarında faktiki olaraq təşəkkül tapan müstəqil dövlətlərin tanınmaması deməkdir. Nizamnamə yalnız 1922/1923-cü illərdə beynəlxalq səviyyədə tanınmış dövlətləri bundan müstəsna tutur". Yeri gəlmişkən, qeyd edək ki,

1922/1923-cü illərdə beynəlxalq aləmdə tanınmış dövlətlər dedikdə, Polşa və Baltik dövlətləri də nəzərdə tutulur.

Nizamnamənin təşkilat əsaslarının təhlilinə gəlincə, Koordinasiya Mərkəzində rusların bütün qeyri-rusların sayı qədər üzv olmaları bu təşkilatda millətlərə "bərabərlik" haqları iddiasının əsassız olduğuna sübutdur. Hələ mərkəz rəhbərliyinə Melqunovun gətirilməsi isə bu təşkilatın qeyri-ruslar haqqında bəslədiyi "xoş niyyəti" açıq göstərməkdədir. O Melqunov ki, indiyə qədər Sovetlər Birliyindən sadəcə Rusiya, buradakı qeyri-rus millətlərdən də "azlıqlar" deyə bəhs etmişdir.

Adı çəkilən Koordinasiya Mərkəzinin nizamnaməsi Azərbaycan Milli Birlik Komitəsi adından Ceyhun Hacıbəyli, Şeyxülislam və Kazımbəy tərəfindən imzalanmışdır. Məlumdur ki, bu şəxslərdən Ceyhun Hacıbəyli ilə Şeyxülislam bədnam Visbaden anlaşmasını da Azərbaycan Milli Birlik Məclisi adından imzalamışlar.

Dr. H. Atamanın başçılığı və mühəndis İsmayıl Sarıyelin katibliyi ilə Azərbaycan koloniyasının öncül şəxsləri bir araya gələrək Məmməd Əmin Rəsulzadənin hesabatını dinlədilər. Rəsulzadə hesabatında Stutqartda keçirilən konfransda rus partiyalarının "Rusiya Millətlərini Qurtarma Şurası" yaratdığını və milli azlıqların bu şuraya cəlb edilməyə çalışıldığını qeyd etdi. O, Visbaden konqresində "Azərbaycan Milli Birlik Məclisi" adından iştirak edən Ceyhun Hacıbəyli, Əkbər Ağa Şeyxüslamov və İsmayıl Əkbərdəyə qarşı kəskin etiraz etdi.

Visbaden konqresində Azərbaycan adına iştirak edən və milli davasına xəyanət edən Ceyhun Hacıbəyli, Əkbər Ağa Şeyxüslamov və İsmayıl Əkbərdəyə etiraz edildi.

H. Zeynallının başçılığı və Dr. A. Yaşatın katibliyi ilə eyni mövzuda 24 noyabr 1951-ci ildə Ankarada ikinci iclas keçirildi ("Kafkasya" junalı, 1952, s. 20).

5 dekabr 1951-ci ildə İstanbulda Azərbaycan siyasi mühacirlərindən Naki Keykurunun başçılığı və Xəlil bəyunun katibliyi ilə keçirilən iclasda, prof. Əhməd Cəfəroğlu, Mirza Bala Məmmədzadə və müəllim Süleyman Təkinər Visbaden konqresinin Azərbaycan milli maraqlarına zidd olduğunu bəyan etdilər.

Gürcüstan Milli Mərkəzi İcra Komitəsi 27 noyabr 1951-ci ildə Parisdə keçirilən iclasda Visbaden konqresində iştirak edən "Gürcü Milli Şurası"nın Gürcü mühacirətini təmsil etmədiyini və bu konqresin Kerenski və tərəfdarlarının bir oyunu olduğunu bəyan etdi. Gürcülər, D. Maçavarainin başçılığı və A. Manvelişvilinin katibliyi ilə 20 noyabr 1951-ci ildə Parisdə keçirilən iclasda Visbaden konqresinə qarşı etirazlarını bildirərək, gürcü millətinin müstəqilliyini və rus mühacirətindən ayrılma haqqını bir daha təyin etdilər ("Kafkasya" junalı, 1952, s. 25).

Şimali Qafqaz Milli Komitəsi 24 noyabr 1951-ci ildə keçirilən iclasda Visbaden konqresində Şimali Qafqaz adından iştirak edən Abdurrahman Avtorhanovun fəaliyyətinə qarşı etiraz etdi və rus mühacirləri ilə iş birliyinə qarşı çıxdı.

## Nəticə

XX əsrin 20-ci illərində Sovet istilasından sonra bir çox Qafqaz siyasi xadimi mühacir həyatı yaşamışdır. Məlum olduğu kimi mühacirlər Almaniyanın Münhen, Visbaden və Ştutqart şəhərlərində siyasi təşkilatlar quraraq antisovet təbliğatı aparmış və Qərb dövlətlərini Sovet repressiyaları barədə məlumatlandırmağa çalışmışlar. 1951-ci ildə Almaniyada keçirilən Visbaden konfransında rus və qeyri-rus mühacir təşkilatları birləşmiş, bu konfranslar mühacirlər arasında daxili ixtilaflar yaratmışdır.

Məqalədə göstərilən faktlardan da aydın olur ki, Visbaden və Münhen bəyannamələri rus imperializminin gizli siyasətini göstərmişdir. Qafqaz və Türküstan xalqlarının azadlıq mübarizəsinə mühacirət həyatında da zərər vurmuşdur.

## Ədəbiyyat

1. *"Azərbaycan" jurnalı.* (1991). 28, 125.
2. *Azərbaycan mühacirət irsi.* (2011). Elm və təhsil.
3. Cabbarov, F. (2018). *Mühacirət irsimizdən: Məhəmmədəmin Rəsulzadənin otuz məktubu.*
4. Hacıbəyli, C. (1952, iyul). "Visbadendən – Ştarnberqə". *"Azərbaycan" jurnalı*, 3.
5. *"Kafkasya" junalı*. (1951). 4-5, 40-44.

6. *“Kafkasya” junalı*. (1952). 16, 20-23.
7. *“Rus demokratı” məcmuəsi*. (1951). 2, 11-12.
8. Yaqublu, N. (2018). *Cümhuriyyət Qurucuları*. “Nurlar” Nəşriyyat-Poliqrafiya Mərkəzi.

Daxil oldu: 16.07.2024
Baxışa göndərildi: 12.08.2024
Təsdiq edildi: 25.09.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/25-30

**Aygün Əhmədova**
Gəncə Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
aygun.medetqizi@mail.ru

# Mollanəsrəddinçi şair Mirzə Məhəmməd Axundov

**Xülasə**

XIX əsrin sonu, XX əsrin əvvəlləri Azərbaycan ictimai, mədəni, ədəbi-bədii mənzərəsinin daha dərindən və əhatəli şəkildə mənimsənilərək dərk edilməsi naminə Mirzə Məhəmməd Axundovun həyat, fəaliyyət və ədəbi-bədii yaradıcılıq yolunun hərtərəfli araşdırılması məsələsi milli ədəbiyyatşünaslığın qarşısında aktual vəzifələrdən biri kimi durmaqdadır.

Mirzə Məhəmməd Axundovun məqalə və felyetonlarında, folklor toplamalarında olduğu kimi, şeirlərində də dövrün mühüm aktual problemləri qaldırılmışdır. Burada siyasi-ideoloji təxribatlar, erməni fitnəsi, onların törətdikləri qırğınlar, maarif, məktəb, təlim və tərbiyə məsələləri fəal vətəndaş, ziyalı təəssübkeşliyi ilə işıqlandırmışdır.

Araşdırmalardan məlum olur ki, elmi ədəbiyyatda da göstərildiyi kimi, Mirzə Məhəmməd Axundovun qızğın ictimai-mədəni və ədəbi fəaliyyəti haqqında hələ XX əsrin əvvələrindən dövrün ayrı-ayrı mətbu orqanlarında, ədibin öz kitablarının üz qabıqlarında və s. onun hər hansı mədəni tədbirdə iştirakı, orijinal və tərcümə əsərlərinin çapa hazır olması və ya çapdan çıxması haqqında müəyyən məlumatlar verilmişdir. Həmin məlumatlar Mirzə Məhəmmədin ictimai-mədəni və ədəbi fəaliyyətinin öz sağlığında da ictimaiyyətin daim diqqət mərkəzində olması haqqında təəssürat yaradır.

***Açar sözlər:*** *şair, milli, mətbuat, cəmiyyət, şeir, müəllif, qəzet*

**Aygun Ahmadova**
Ganja State University
Doctor of Philosophy in Philology
aygun.medetqizi@mail.ru

# Mollanasraddinist Poet Mirza Mahammad Akhundov

**Abstract**

In order to gain a deeper and comprehensive understanding of the social, cultural, literary and artistic landscape of Azerbaijan at the end of the 19th century and the beginning of the 20th century, Mirza Muhammad Akhundov’s issue of a comprehensive investigation of the life, activity and literary and artistic creative path is one of the urgent tasks before the national literary studies.

In Mirza Mahammad Akhundov's articles and feuilletons, folklore collections, as well as in his poems, important topical issues of the time were raised. Here, political-ideological provocations, Armenian sedition, massacres caused by them, education, school, training and upbringing issues were illuminated with the fanaticism of an active citizen and intellectual.

It is known from the researches that, as shown in the scientific literature, Mirza Muhammad Akhundov's active social, cultural and literary activities were reported from the beginning of the 20th century in different periodicals, on the covers of the writer's own books, etc. certain information is given about his participation in any cultural event, original and translated works being ready for publication or out of print. These data create the impression that Mirza Muhammad's social, cultural and literary activities were always in the center of attention of the public even during his lifetime.

***Keywords:*** *poet, national, press, society, poetry, author, newspaper*

## Giriş

Mirzə Məhəmməd Axundov həm də şair kimi tanınır. Onun şeirləri həm məzmun və formasına, həm də ideya-bədii xüsusiyyətlərinə görə rəngarəngdir. Yəni burada ölkədə baş verən yeniliklər-milli mətbuatın inkişafı, yeni tipli məktəblərin açılması, gənc nəslin elm və təhsilə meyli, eyni zamanda cəmiyyətdə hələ də qalan laqeydlik, ətalət, milli mənəvi dəyərlərimizə və tarixi şəxsiyyətlərimizə bəslənən etinasızlıq, köhnə fikirli qüvvələrin hələ də qüvvətli olub yeniliyə qarşı maneə törətmələri, aclıq problemi və s. məsələlər Mirzə Məhəmməd şeirlərində öz əksini tapmışdır. Bu şeirlər həm klassik üslubda, həm də yeni poetik formada – "Molla Nəsrəddin" jurnalının poeziya məktəbinə uyğun forma və məzmundadır. Məsələn, şairin "Qəzet" şeiri müxəmməs formasındadır.

Qeyd etmək lazımdır ki, "Qəzet" şeiri M. M. Axundovun sağlığında çap edilməmişdir. Onun əlyazmasını Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi əməkdaşı, filologiya üzrə fəlsəfə doktoru Şəlalə Ana Hümmətli "AMEA Əlyazmalar İnstitutunun arxivində mühafizə edilən əlyazma materiallarını araşdırarkən əldə etmiş" və onu institutun elmi əməkdaşı, şərqşünas Hacı Mustafa Mail oğlunun ərəb əlifbasından çevirməsi ilə 21 iyul 2005-ci il tarixli "Azadlıq" qəzetində dərc etdirmişdir. Şeirdə qəzetin əhəmiyyəti elmə bərabər tutulur, o, xalqı hər işdən agah edən, düz yola yönəldən, onu işıqlı gələcəyə aparan bir nemət kimi təqdim və tərif edir. Şeir əvvəlcə belə bir təqdimatla başlayır:

Elmə nisbət, tərbiyətbəxşeyi-aləmdir qəzet.
Məclis ara olmağiylə müsəlləmdir qəzet.
Sübhi misli-miraət- Skəndər- sağəri-cəmdir qəzet
Aləmin könlündəki əsrarə mərhəmdir qəzet
Xatiri şad etməyə hər dəm müsəmməmdir qəzet (Axundov, 2005).

Göründüyü kimi, müəllif qəzetin məziyyətləri sırasına onun cəmiyyətdə tərbiyəvi təsirə malik olması, yəni "tərbiyəbəxşi-aləm olması hər şeydən, hər bir sirdən xəbər verməsi, insanların ürəyindən xəbər verməsini, yəni "aləmin könlündəki əsrarə mərhəm" olması, ayrı-ayrı adamların ruhunu oxşayıb, xatirini xoş etməsi, daha doğrusu, bu cür işlərə daima hazır olması və s. bu cür keyfiyyətləri aid edirdi. O bildirirdi ki, bütün bu əlamətləri ilə qəzet insanlara inkişafın, tərəqqi və elmin, insanlığın, birlik və ədalətin yollarını nişan verir:

Göstərir yol daimül-övqat insaniyyətə,
Dəvət eylər elmə, xoş əxlaqə ürfaniyyətə,
Zərbə endirməkdədir məbnayi-şeytaniyyətə,
Sevməz insan qeyd olunsun həbli-heyvaniyyətə
Məqsədimə istiqamət ilə möhkəmdir qəzet.

M. M. Axundov qəzetin cəmiyyət üçün əhəmiyyətindən danışarkən bildirir ki, o, yəni qəzet adamlara insanlığın, əxlaq və ürfanlığın yolunu göstərir. Bununla da onu şeytan əməlinə uymaqdan qoruyur. O, insanlıqla heyvanlığın, qanmazlığın bir araya gəlməsi ilə heç cürə barışa bilmir. Həm də bütün bu məziyyət və məqsədindən, amalından dönmək barədə heç fikirləşmir, yəni "məqsədimə istiqamət ilə möhkəmdir qəzet". O çalışır ki, insanlar təklikdən, yalnız özünü düşünməkdən ictimailiyə, birliyə meyilli olsunlar. Qəzet insanlara kin və ədavətin hər iki tərəf üçün ziyanlı olduğunu, qarşılıqlı mehribanlığın, anlaşmanın isə mənfəət gətirdiyini göstərir.

Şairə görə, qəzet bütövlükdə mətbuat öz yazıları, həmin yazılarda irəli sürülüb işıqlandırılan fikirlərlə insanların məlumatlarını artırır, biliklərini genişləndirir, gördükləri işlərdə onlara düz və səmərəli yol göstərir. O, bütün gücünü, qüvvətini dağılmış, pozulmuş işlərin sahmana salınmasına, adamların başladıqları xeyirli işlərin başa çatdırılmasında əzmkar olmalarına kömək edir. Bu cəhətdən sadiq dost kimidir.

Qəzetin cəmiyyətə, insanlara etdiyi bütün kömək onların istiqlallarının, gələcək həyatlarının işıqlı, güzəranlarının firavan keçmələrinə yönəlmişdir. Bütün bunlar isə onun səhifələrindəki materiallarda aydın görünür.

Mirzə Məhəmməd göstərir ki, qəzetin səhifəsi sanki indinin, keçmişin və gələcəyin aynasıdır. Bu aynada bəşər övladının bütün əməlləri, arzu və istəkləri, gün-güzəranı, o cümlədən kasıbın çəkdiyi əziyyətlər, məhrumiyyətlər, mülkədarların öz iddialarında əvvəlki kimi qaldıqlarını, rəhmsizliklərini əks etdirir. Bir sözlə, hansı ictimai və ya hökumət gücü olur-olsun, mətbuata fərq etməz, o həmin güclərin hamısının öhdəsindən gəlməyə, onları xar etməyə qadirdir. Çünki qəzet "rübi məskunun bütün gizlinlərini izhar edər", öz materiallarında yaxşı haqda yaxşı, yaman haqda onun özünə və əməllərinə uyğun olaraq, yaman əxbar edər". Qəzetin gözündən heç bir cəhət, heç bir gizlin yayınmadığı kimi, o, ariflərlə də arifanə davranır. Daha doğrusu, "adili təsbihi-arifdun xoşrəftar edər". Bütün bunlar isə qəzetin "hüsni-xülqə rəhnuma elmilə həmdəm" olması ilə əlaqədardır. Qəzetin həyatda haqqın, ədalətin, firavanlığın, dinclik və bolluğun tərəfdarı, bütün həyati nemətlərin ümumən bəşər övladına, onun təminatına yönəldilməsi tərəfdarı olması onun fəaliyyətinin mahiyyətini müəyyənləşdirir. O, həyatda heç bir nizam-intizamın pozulmasını, birinin digərinə ziyan vurmasını və bu cür hallarla digərlərinin barışmasını, cahilliyin hökmranlığını istəmir.

Qəzetin – mətbuatın əsas məqsədi cəmiyyətin sağlam ruhda olması, birinin digərinə əl tutmağa çalışması üstə köklənməlidir. O, xalqı elmə, irfana dəvət etməklə cəhalətin, kin və ədavətin aradan qaldırılmasına cəhd edir. Onun nur saçan ziyası aləmə xoşbəxt gələcəyin işıqlı yollarını göstərir.

**Tədqiqat**

Mirzə Məhəmməd qəzetə, ümumən mətbuata yüksək qiymət vermişdir. Onun fikrincə, qəzet haqqın, ədalətin, xoşbəxtliyin, insanlığın, elm və tərəqqinin carçısı, cəhalətin, kin və ədavətin, geriliyin, zülm və haqsızlığın düşmənidir. Şair inanırdı ki, milli mətbuatın inkişafı cəmiyyətin bütün zümrələrinin şüurunda bir tərpənişə, inkişafa səbəb olacaq. Müşahidə etdiyi bu cür əlamətləri " oyandı" rədifli "Nəzm" başlıqlı satirasında belə təsvir etmişdir:

...Hər həftə yazırsan ki, müsəlmanlar oyanmaz,
Hürriyyəti qanmaz.
Həqdir sözün, amma bu müsəlmanlar inanmaz,
Heç kəs bunu danmaz.
İndi görəsən arifü-danalar oyandı,
Binalar oyandı (Mirəhmədov, 1988, s. 302-303).

M. M. Axundov Molla Nəsrəddinə müraciətlə bildirir ki, hər gün sən müsəlmanın bu ətalət və qəflət yuxusundan oyana bilmədiyindən yazırsan. Bunlar doğrudur. Ancaq bu sözlərə müsəlmanlar heç cürə inana bilməz. Çünki onlar çoxdan oyanmışlar. Sonra müəllif islam aləmindəki oyanmanın, zirəkliyin nədən ibarət olduğu barədə bir-bir məlumat verir. Şeirin sonrakı bəndinin hər birində həmin oyanıqlığın ayrı-ayrı lövhələri və xarakteri təsvir edilir.

Qafqazda soyğunçuluq, qaçaqlıq, haqsızlıq edənlər divan-dərə ilə şərikli fəaliyyət göstərirlər. " Molla" yəni "Molla Nəsrəddin"ə bildirir ki, onlara öyüd-nəsihət təsir etmir. Odur ki bu işlərə xüsusi diqqət yetirmək lazımdır, onlardan çox yazmaq gərəkdir. Bu soyğunçulara edibən nəsihət, deyilən söz sanki daşa, divara dəyib geri qayıdır. Bunların yolgöstərənləri isə fırıldaqçı mollalarla kələkbaz cindarlardır. Yəni xalq həm hökumət məmurlarının, həm də xurafatın cəngində qalıb çırpınmaqdadır. Bütün bunlar azmış kimi, cürbəcür adda bitib tükənməyən vergilər xalqın güzəranını daha da ağırlaşdırmaqdadır.

Elmi ədəbiyyatda göstərildiyi kimi, M. M. Axundovun "Ac" şeiri M. Ə. Sabirin "Tömeyi-nəhar" satirasının təsiri ilə yazılıb. Bu haqda sabirşünas professor Məmməd Məmmədov haqlı olaraq yazmışdır: "Ac şeiri Sabir satirasının təsiri altında yazılıb "Molla Nəsrəddin" səhifələrində dərc edilmiş ilk poetik nümunə sayıla bilər. Bu əsər üzərində "Tömeyi-nəhar"ın təsiri olduqca qüvvətli idi. Sonralar bəzi tədqiqatçılar tərəfindən "Ac" şeirinin hətta Sabir qələminin məhsulu kimi səciyyələndirilməsi, "Qeybi" imzasının xalq şairinə istinad verilməsi də bu iki əsər arasındakı ideya-tematik əlaqələrin sıxlığından irəli gəlmişdir" (Məmmədov, 1974, s. 37; 64, 99).

Doğrudan da, "Molla Nəsrəddin" jurnalının 14 aprel 1907-ci il tarixli 15-ci nömrəsində çap edilən "Tömeyi-nəhar" satirasında Sabir yazırdı:

Taxıl, taxıl deyib də çox çığırma zəngəzurlu tək,
Bəyin-xanın, xanın-bəyin əlində ehtikarı gör
(Sabir Mirzə Ələkbər, 2012, s. 91).

5 avqust 1907-ci ildə isə M. M. Axundov "Ac" şeirində yazırdı:

Xanın damaq vaxtıdır.
Nolub nəvayi cəngü ney.
Nə Zəngəzur fəqirini,
Nə orda ac qalanı gör (Mirəhmədov, 1988, s. 554).

Bütün bunlar M. M. Axundovun – "Qeybi"nin həm də Sabir poeziya məktəbinin nümayəndəsi olduğunu göstərir.

M. M. Axundov müsəlman əhlinin geriliyini, cahilliyini onun elmsizliyi ilə əlaqələndirir, təəssüflə bildirir ki, bu cəhət ölkədə hər cürə zülm və ədalətsizliyin tüğyan etməsinə səbəb olur; azadlıq hərəkatı Təbrizdə, ümumən İranda qanına qəltan edilib amansızlıqla yatırılır. Bütün bunlar şairin "Yazıblar" rədifli satirasında sənətkarlıqla açılıb göstərilmişdir. Məsələn, şeirdə oxuyuruq:

...Elm əhli olub rütbədə insani-mükəmməl,
Bielmliyi qeyr müsəlmanə yazıblar.
Elmin hünərin kəsb eləyib milləti-islam,
Qəflətdə yatıb qalmağı almanə yazıblar.

Ancaq sonrakı misralar müsəlmanların necə elm qazanıb, almanların isə elmsiz qalmalarını aydın göstərir. Əslində, məlum olur ki, "Öz məmləkətin elmlə abad qılanlar, ancaq bizim İranı da viranə yazıblar". Sonra şair bu viranəliyin səbəblərini və ayrı-ayrı səhnələrini göz önündə poetik şəkildə belə təsvir edir:

Qan tökməyə Həccacla Çingiz cəfasın
Mollalarımız Təbrizə, Tehranə yazıblar
...Biçarə rəiyyətləri şahım tərəfindən,
Qultək eləyib mollalara, xanə yazıblar
Məşrutəni sidq ilə qəbul etdi ölən şah,
Azadəliyin nəfsini dövranə yazıblar.

"Qeybi", yəni M. M. Axundov göstərir ki, bu cür tale yazısının nəticəsi çox acınacaqlı olmuşdur. O, Səttərxan hərəkatının yatırılmasından sonra ölkədə ayrı-ayrı qaniçən xanların əməlləri haqqında yazır:

Xud Xərbübəlayə yazılan hökmi-Yezidin,
İcrasını Təbrizdə Rəhim xanə yazıblar.
Mirhaşıma Təbrizi, Şükür xanə Mərəndi,
Mirzə Həsənin hökmünü Zəncanə yazıblar.
Təbrizdə nahəqq tökülən qanları həqqa,
Məşrutə pozan zadeyi-Mərdanə yazıblar
(Mirəhmədov, 1988, s. 293).

Göründüyü kimi, Mirzə Məhəmməd müsəlmanlığın hansı "elmlərə" və necə yiyələnmələrini satirik şəkildə təsvir etmişdir. Həmin "tərəqqinin" qanlı nəticələrini isə vətəndaşlıq yanğısı və ürək ağrısı ilə diqqətə çatdırmışdır.

M. M. Axundov ətalət və cəhalətin müsəlmanları zəlalətə saldığını göstərib, bu işlərdə maraqlı və əli olanları isə tənqid etdiyi kimi, tərəqqi və inkişafı hər hansı oyanmanı, yeniliyi alqışlamışdır.

Şairin "Cavanlar" şeiri maraqlıdır. Şeirdə gənc nəslin elm və maarifə marağının artması, yeniliyin işartılarının görünməsi ilə barışa bilməyən köhnələrin şikayətləri öz əksini tapmışdır. Orada köhnəpərəst, yeniliklə öz mənafeyi naminə barışa bilməyən satirik tipin dilindən oxuyuruq (Mir Cəlal, 1946):

Gətirdi məni lap təngə bu biar cavanlar.
Vurdu sinəmə gör necə odlar cavanlar.

Sonrakı misralar bu cavanların köhnəpərəstin sinəsinə necə odlar vurduğunu, onu niyə təngə gətirdiyini, bu satirik tipin niyə və nədən təngə gəlməyinin səbəblərini belə açıb göstərir:

Keçmişdə əcəb naz ilə dövran sürər idim,
Bimareyi-əğyar nə hörmət görər idim,
İnsanları mən aləti-ruzi bilər idim,
İndi eləyibdir günümü tar cavanlar.

Gah məktəbü, gəh mədrəseyi-tazə açarlar,
Hər mənsərəyə gündə bir əndazə açarlar,
Tainki xəlayiq oxuyub yazə, açarlar
Ki varı yox eylər, yoxu da var cavanlar.

Göründüyü kimi, köhnəpərəst özü üçün xoş keçən keçmişlərin həsrətini çəkir. Çünki o vaxtlar onun bir sözü iki olmazdı, verdiyi bütün göstərişlər, etdiyi bütün tələblər yerinə yetirilərdi. İndi isə ziyalı cavanlar peyda olublar. Onlar da insanları özünə ruzi alətinə çevirənlərin əl-ayağını hər yerdən kəsməyə başlayıblar, hər şeyi təzə açdıqları məktəb və mədrəsələrin mənfəətinə yönəldir, bizim ruzi mənbələrimizi qapayır, sözümüzü saya salmırlar. Onu narahat edən əsas məsələlərdən biri odur ki, əvvəllər xalqı avam saxlayıb, onları soyub taladığı halda, bu cavanlar onların gözünü açmağa, xeyir və şərlərini başa salmağa başlayıblar (Mir Cəlal, 2024, s. 392; Nağısoylu, 2010).

## Nəticə

Xalqın qənimi, onun avam qalmasında maraqlı olan bu köhnəpərəstlər dərin təəssüf və yanğı ilə əldən çıxan keçən günlərdə olan firavanlıqlarının bir də geri dönməyəcəyindən şikayətlənir. O, yaxşı başa düşür ki, daha xalqı əvvəlki kimi itaətdə saxlaya, onları əvvəlki kimi öz əlində "ruzi aləti" kimi vasitəyə çevirə bilməyəcək. Həmin itkilərin yanğısını, bütün bunlara səbəb olan ziyalı cavanlara nifrətini belə ifadə edir:

Getdi, dəxi gəlməz bilirəm bir də o çağım
Söndürdü xəlayiq nə yaman yerdə çırağım,
İşrətdən əlim çıxdı, dəxi yoxdu dimağım,
Gördü mənə bu fəqri səzavar cavanlar,
Bidar cavanlar!

Köhnəpərəst, hər cür yeniliyə və tərəqqiyə düşmən olan tip yenilik təmsilçisi olan gənclərə nifrət edir. Çünki onların cəmiyyətə gətirdiyi yeni ideyalar bunun rahatlığını pozur, ruzi mənbələrini bir-bir əlindən çıxarır. O başa düşür ki, ötən günlər bir də geri dönməyəcək. Bununla belə köhnəpərəstlər, din və xurafat təmsilçiləri hələ kifayət qədər güc və nüfuza malikdirlər. Onların hökmlərinə tabe olanlar da az deyil.

Apardığımız araşdırma və təhlillərdən aydın oldu ki, Mirzə Məhəmməd Axundovun məqalə və felyetonlarında, folklor toplamalarında olduğu kimi, şeirlərində də dövrün mühüm aktual problemləri qaldırılmışdır. Burada siyasi-ideoloji təxribatlar, erməni fitnəsi, onların törətdikləri qırğınlar, maarif, məktəb, təlim və tərbiyə məsələləri fəal vətəndaş, ziyalı təəssübkeşliyi ilə işıqlandırmışdır.

Tarixi mədəni irsə qayğı və diqqət, gənc nəslin tərbiyəsi, maarif və elmə yiyələnməsi məsələləri, xurafat və cəhalətin tənqidi onun şeirlərinin əsas mövzusunu təşkil edir. Həmin əsərlərdə irəli sürülən məsələlər bu gün də aktualdır.

## Ədəbiyyat

1. Axundov, M. M. (2005, 21 iyul). Qəzet (şeir). “*Azadlıq” qəzeti*.
2. *“Molla Nəsrəddin” jurnalı*. (1988). I cild. Əziz Mirəhmədov. (red.). Yazıçı.
3. Məmmədov, M. (1974). M. Ə. Sabir və demokratik Azərbaycan mətbuatı. Kamran Məmmədov (red.). Elm.
4. Mirzə Ələkbər Sabir. (2012). Hophopnamə. Tərtib edən, müqəddimə və qeydlərin müəllifi Alxan Bayramoğlu (Məmmədov). Teymur Kərimli. (red.) Təhsil, 552.
5. *“Molla Nəsrəddin” jurnalı*. (1988). 10 cilddə. I cild. Redaktoru və ön sözün müəllifi: Əziz Mirəhmədov.
6. *“Molla Nəsrəddin” jurnalı.* (1988). 10 cilddə, I cild. Redaktoru və ön sözün müəllifi: Əziz Mirəhmədov.
7. Mir Cəlal. (1946). *Azərbaycanda ədəbi məktəblər* (1905-1917-ci illər). Dissertasiya. BDU kitabxanası.
8. Mir Cəlal. (2024). *Azərbaycanda ədəbi məktəblər* (1905-1917-ci illər). Təhsin Mütəllimov. (elmi red.) Ziya-Nurlan.
9. Nağısoylu, M. (2010). *“Məclis yaraşığı” – yumor, gülüş toplusu*. Məclis yaraşığı.

Daxil oldu: 02.08.2024
Baxışa göndərildi: 30.08.2024
Təsdiq edildi: 28.09.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/31-36

**Sergey Klimov**
Azerbaijan University of Languages
Ph. D. student
seriydoc19@gmail.com
UDC 327

# Tourism as a Tool for Strengthening the "Soft Power" of Azerbaijan

**Abstract**

The relevance of this topic is due to the fact that tourism today is a powerful and effective tool of "soft power" in Azerbaijan. The current state, principles and main directions of state policy in the field of tourism are considered. The importance of an integrated approach in the field of tourism research is emphasized. Scientific novelty lies in the analysis of new aspects and trends in tourism development, the search for new solutions and approaches to improving the tourist experience, as well as the application of new methods and technologies for the analysis and management of the tourism industry. The article provides recommendations for the development of tourism in Azerbaijan, which contributes to the strengthening of "soft power".

***Keywords:*** *Azerbaijan, tourism, soft power, infrastructure, investment*

**Sergey Klimov**
Azərbaycan Dillər Universiteti
doktorant
seriydoc19@gmail.com
UDC 327

# Turizm Azərbaycanın "yumşaq güc"ünü gücləndirmək aləti kimi

**Xülasə**

Bu mövzunun aktuallığı onunla bağlıdır ki, bu gün turizm Azərbaycanda "yumşaq güc"ün güclü və effektiv vasitəsidir. Turizm sahəsində dövlət siyasətinin mövcud vəziyyəti, prinsipləri və əsas istiqamətləri nəzərdən keçirilir. Turizm tədqiqatları sahəsində kompleks yanaşmanın önəmi vurğulanır. Elmi yenilik turizmin inkişafının yeni aspektləri və tendensiyalarının təhlili, turizm təcrübəsinin təkmilləşdirilməsi üçün yeni həll yolları və yanaşmaların axtarışı, habelə turizm sənayesinin təhlili və idarə edilməsi üçün yeni metod və texnologiyaların tətbiqi ilə bağlıdır. Məqalədə Azərbaycanda "yumşaq güc"ün güclənməsinə töhfə verən turizmin inkişafı üçün tövsiyələr verilir.

***Açar sözlər:*** *Azərbaycan, turizm, yumşaq güc, infrastruktur, investisiya*

## Introduction

Tourism is one of the most dynamically developing industries in the modern world. Representing an effective tool for shaping a positive country image and strengthening international influence, tourism plays a crucial role in the context of soft power. It contributes to cultural exchange, the formation and strengthening of a country's image, economic development, the expansion of international ties and cooperation. Specific efforts and investments in tourism development can enhance a country's influence and promote its interests on the international stage (Casado, Pastrana, & Saavedra, 2023, pp. 66-80).

**Research**

Tourism plays a crucial role in shaping the image and reputation of a country on the global stage. For Azerbaijan, a nation with a rich cultural heritage and breathtaking natural beauty, tourism has emerged as a powerful tool for boosting its soft power and enhancing its influence in the international arena.

− *Menyular:* Dünyanın hər yerindən onlayn menyular tapılır. Bu, əla qrup işi ola bilər və restoran rollarını təyin etmək, inqrediyentləri araşdırmaq, Google xəritədə restoranı tapmaq, onlayn rəyləri tapmaq və s. kimi genişləndirmək üçün sonsuz imkanlar var.

− *Reseptlər:* Onlayn bloqlardan hədəf dildə reseptlərin kəşf edilməsi əksər tələbələrin böyük marağına səbəb olan mövzu üzrə lüğəti gücləndirir (Reeves, Herrington, & Oliver, 2002b). Əlbəttə ki, reseptlər feilin məsdər formasını da tətbiq edir. Bir çox internet resept bloqları da YouTube-dakı videolarda təlimatları təqdim edir. Bu cür sadə video tələbələrin uğurlu dil öyrənməsi üçün çox yaxşı üsul ola bilər.

− *Supermarketlərdən və ya digər mağazalardan onlayn alış-veriş və ya veb-saytlar:* Bu fəaliyyətin üstünlüyü son dərəcə sadə və yeni başlayanlar üçün uyğun olması və bütün səviyyələrdə öyrənənlərin səviyyəsindən asılı olaraq genişləndirilə bilməsidir. Hər bir məhsul fotoşəkillərlə təsvir edilir. Öyrənənlər supermarket xüsusi məhsulları və ya evə çatdırılma xidmətləri üçün onlayn prospektləri tapır. Tələbələr xəyali alış-veriş səfərinə göndərilir, orada onların araşdırdıqları resept inqrediyentlərini almaq üçün xərcləyəcəkləri müəyyən məbləğ olur (Rule, 2006, pp. 1-10).

− *Müəyyən bir şəhərdə və ya müəyyən qrupların arasında baş verən hadisələr:* Hədəf dilin danışıldığı müəyyən bir şəhərdə hansı hadisələrin baş verəcəyi araşdırılır. Bu fəaliyyət tarix və vaxt nöqtəyi nəzərdən daha faydalı olur. Və ya bəlkə də, mahnı sözlərini təqdim etmək üçün növbəti fəaliyyət mahnını ifa edən qrupun konsert cədvəlini izləmək ola bilər.

− *Şəhər məlumat saytları:* Şəhərlərdə, adətən, görməli yerləri, yaşayış yerlərini, restoranları və s. təsvir edən sadə dildən istifadə edən veb-saytlar olur. Təbii ki, bu, müəyyən turistlik nöqtələrdə çox maraqlı olar (Reeves, Herrington, & Oliver, 2002). Sinif otellərə və ya yataqxanalara, yerli restoranlara və ya bazarlara gündəlik fəaliyyət marşrutu ilə əhatə edən virtual səyahət planlaşdıra bilər. Bu, həm də bir neçə həftə ərzində uzadılan əla qrup işi məşqi ola bilər.

− *Stolüstü oyunlar:* Hədəf dildə stolüstü oyunlar orijinal dilin əsas mənbələrindən biridir. Müəyyən miqdarda mətni ehtiva edən Pictionary və ya Monopoly kimi tanış oyunları oynamaq bu fəaliyyəti yeni başlayanlara təqdim etmək üçün asan bir yoldur. Həmçinin müəllim və tələbələr hədəf dilin danışıldığı ölkədə məşhur olan oyunları tapmağa çalışırlar. Daha qabaqcıl tələbələrə təlimatları oxumaq tapşırığı verilə bilər ki, onlar qaydaları özləri anlamağa çalışsınlar.

## Nəticə

Nəticə olaraq, orijinal dil materialından istifadə, həqiqətən, interaktiv sinif dizayn etmək üçün əla bir yoldur. Xarici dil sinfi dərslik formatı ilə məhdudlaşırsa, nəticədə, o, təhlükəsiz, proqnozlaşdırıla bilən və dünyəvi olur. Sinif otağına orijinal materialları daxil etməklə, tələbələrdə dilə və onun danışıldığı ölkələrin mədəniyyətinə dair inam və maraq inkişaf edir. Beləliklə, tələbələr boş vaxtlarında öz axtarışlarını həyata keçirir və bu axtarışları öz dil maraqları ilə birləşdirirlər.

## Ədəbiyyat

1. Horzum, M. B. və Bektaş, M. (2012). Orijinal öyrənmənin ictimai xidmət təcrübəsi kursunu keçən müəllim namizədlərinin münasibətinə və məmnunluğuna təsiri. *Kastamonu Təhsil Jurnalı,* 20(1), 341-360.
2. Horzum, M. B., Bektaş, M., Can, A. A., Üngören, Y. və Sellüm, F. S. (2019). Müəllimlər üçün həqiqi öyrənmə hazırlığı şkalası: Etibarlılıq və etibarlılıq tədqiqatı. *Beynəlxalq Sahə Təhsili Jurnalı*, 5(2), 94-106.
3. Berardo, S. A. (2006). The use of authentic materials in the teaching of reading. *The reading matrix,* 6(2), 60-69.
4. Meyers, N. M., & Nulty, D. D. (2009). How to use (five) curriculum design principles to align authentic learning environments, assessment, students' approaches to thinking and learning outcomes. *Assessment & Evaluation in Higher Education,* 34(5), 565-577.
5. Neo, K. T. K., & Tan, H. Y. J. (2012). Applying authentic learning strategies in a Multimedia and Web Learning Environment (MWLE): Malaysian students' perspective. *TOJET: The Turkish Online Journal of Educational Technology,* 11(3), 50-60.

6. Reeves, T. C., Herrington, J., & Oliver, R. (2002a, April). Authentic activitiy as a model for web-based learning. *In Annual Meeting of the American Educational Research Association*.
7. Reeves, T. C., Herrington, J., & Oliver, R. (2002b). Authentic activities and online learning. *HERDSA*, 562-567.
8. Rule, A. C. (2006). The components of authentic learning. *Journal of Authentic Learning*, 3(1), 1-10.
9. Tan, H. Y. J. (2012). *Authentic learning principles in a web-based student-centred learning environment* (Unpublished master's thesis). Malaysia: Multimedia University.

Daxil oldu: 25.08.2024
Baxışa göndərildi: 17.09.2024
Təsdiq edildi: 02.10.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/46-51

**Pərvanə Qasımova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
atilla.emrahli@gmail.com
https://orcid.org/0000-01234-5657-8898

# Folklor nəzəriyyələri

## Xülasə

Folklorun estetik əhəmiyyəti ilk öncə onunla şərtlənir ki, o dil, fikir və bədii düşüncənin əsasında xalqın yaratdığı mükəmməl bir söz sənətidir. Folklor xəyal, təxəyyül, fantaziya və simvolikadan sənətkarlıqla istifadə edərək gerçəkliyi dolayı yolla motivləndirir və onu poetikləşdirir. Bu poetikləşdirmə, sənət yaratma prosesində əsas vəzifəni xalqın bədii zövqü yerinə yetirir. Yəni xalqın bədii zövqü folklorun estetik ölçülərini müəyyənləşdirən və modelləşdirən əsas faktor rolunda çıxış edir. Folklor formaları əsrlərlə xalq sənətkarları tərəfindən cilalanıb və estetik ölçülərini sabitləşdirib. Ona görə də folklor estetik hissi, gözəllik hissini, dil, ritm və forma gözəlliyi duyğusunu inkişaf etdirir. Folklorun estetik gücü ədəbiyyat, musiqi, teatr və s. kimi sənət növlərinin inkişafında böyük əhəmiyyət daşıyır. Məqalədə bütün bunlar öyrənilərək araşdırılır, foklorun səciyyəvi xüsusiyyətləri üzə çıxarılır.

***Açar sözlər:*** *folklor, xalq, xüsusiyyət, ədəbiyyat, estetika*

**Parvana Gasimova**
Azerbaijan State Pedagogical University
atilla.emrahli@gmail.com
https://orcid.org/0000-01234-5657-8898

# Theories of Folklore

## Abstract

The aesthetic importance of folklore is determined by the fact that it is a perfect art of words created by the people on the basis of language, ideas and artistic thinking. Folklore indirectly motivates reality and poeticizes it by skillfully using dreams, imagination, fantasy and symbolism. In the process of this poeticization, art creation, the main task is performed by the people's bad taste. That is, the artistic taste of the people acts as the main factor that determines and models the aesthetic dimensions of folklore. Folklore forms have been polished by folk artists for centuries and stabilized their aesthetic dimensions. Therefore, folklore develops aesthetic sense, sense of beauty, sense of beauty of language, rhythm and form. The aesthetic power of folklore is literature, music, theater, etc. is of great importance in the development of such arts. In the article, all this is studied and investigated, the characteristic features of folklore are revealed.

***Keywords:*** *folklore, folk, character, literature, aesthetics*

## Giriş

Termin olaraq "Folklor" (Folk-lore) ingilis sözü olub, "xalq hikməti", "xalq müdrikliyi" və "xalq bilikləri" mənasını bildirir. "Folklor" sözü termin kimi ilk dəfə 1846-cı ildə ingilis alimi Uilyam Toms tərəfindən işlədilmişdir. William J. Thoms "Atheneum" adlı jurnalda Ambrose Merton təxəllüsü ilə yazdığı məqalədə "popular antiquites" (xalq əntiqləri, xalq inciləri) deyilən nümunələri toplayıb nəşr etmək fəaliyyətini adlandırmak üçün "Folk-lore" terminini düşünüb təklif etmiş və bu termin elmi ictimaiyyət tərəfindən qəbul edilmişdir. Bu dönəmdə Toms tərəfindən nəşr edilən "Notes and Quaries" (Qeydlər və qaynaqlar) adlı jurnal və digər məhəlli xalq mədəniyyəti dərgiləri ingilis folklorunu toplama və nəşr fəaliyyətini təşkil edən ilk qurumlardır. 1878-ci ildə dünyada ilk folklor araşdırma dərnəyi olan "The Folklore Sosiety" (Folklor cəmiyyəti) qurulur və

"Folklore" adlı jurnal təsis edilir. Bu jurnal bu günədək nəşr olunmaqdadır. Bunun ardınca ölkənin müxtəlif yerlərində folklor araşdırma təşkilatları yaradılır. Bunlara Kembricdəki "Folklor cəmiyyəti"ni, Oksforddakı "Ascholean Museum", "Scottish archive for etnological, Lingusitic and folkloric studies" və "Royal Scottish Museum" misal göstərilə bilər (Çobanoğlu, 2002, s. 19).

**Tədqiqat**

İngiltərədə folklorşünaslıq ənənələr elmi olaraq qəbul edilir. Folklorşünaslıq insanlar arasında ən çox yayılan, ən davamlı və qədim olan xalq yaradıcılığını, xalq sənətləri və xalq sənayesi nümunələrini araşdırır. Eyni zamanda folklorşünaslıq təkcə yazılı materialları deyil, babalardan qalan ənənələrin təsiri ilə bu gün də yaşayan inancların, peşələrin və fəaliyyətlərin öyrənildiyi elm sahəsi olaraq qəbul edilmişdir (Dorson, 1955, s. 99).

Folklor qanunlarının meydana gəlməsindən əvvəl təsadüfən və ya fərqli məqsədlərlə bu gün folklora aid olan mövzularda elmi dəyərləndirmələr həm beynəlxalq miqyasda, həm də ayrı-ayrı ölkələrdə aparılımış və bu sahədə nəzəri təcrübə meydana gəlmişdir. Bu nəzəri mataeriallarda da folklora baxışlar müxtəlifdir. Bunlardan birinə görə (Damici Raci, 1952, s. 293), alman folklor tədqiqatlarının tarixi Hz. İsadan sonra birinci əsrə qədər gedib çıxır. Çünki miladan sonra 100-cü ildə Tacitusun hazırladığı "Germania" adlı əsərdən başlayaraq 16 və 17-ci əsrlərdə almanlar arasında alman qədim xalq əsərlərini toplama (antiquryen) işləri, adət-ənənələrin qeydə alınması gizli və başqa məqsədlər üçün edilmiş olsa da, bunlar indiyədək qaranlıq qalmışdır.

XVII əsrin sonundan etibərən, tarixi və coğrafi, həm də qədim xalq əsərlərini toplaması bir əntiqçi marağını aşaraq inkişaf etmiş, bundan sonra folklor artıq material kolleksiyaçılığından başqa ciddi bir elmi tədqiqat olaraq görünməyə başlamışdır. Bu ilk cığırların açıldığı dövrdə alman universitetlərində hurilər və ruhlar kimi, xüsusilə də folklor sahəsində yer tutan mövzuları elmi işlərdə qələmə aldıqlarını belə müşahidə edirik. Ancaq bunlar, xüsusən də 18-ci əsr boyunca zəifləməyə və imtina olunmağa başladı. Belə mövzulara daha çox ilahiyyat və oxşar elmlər tərəfindən müraciət olunurdu.

Hazırda mövcud olan folklor nəzəriyyəsinin təməlləri alman Qrim qardaşları tərəfindən XIX əsrin birinci yarısındakı araşdırmalarında qoyulmuşdur. Jacob Qrimmin alman folklor tədqiqatlarına verdiyi istiqamət yaxın zamanlara qədər alman folklorşünaslığının əsas xarakterini təşkil edirdi. Qrim qardaşları yaşadıqları dövrün və tanınmış filosof Herderin istiqamətləndirdiyi romantik mühitin təsiri ilə "alman olma" xüsusiyyətinə malik olan hər şeyin saxlanıb qorunması məqsədilə hərəkət edirdilər. Bu istiqamətin əsasında, xüsusilə Nopaleon dövrünün Fransız imperializmi, millətlərarası kosmolotizm və alman mədəniyyətinə uyğun mədəni imperialist təhdidin təsirləri dururdu.

Qrim qardaşlarının "almanlıqla" və "almanı alman edən xüsusiyyətlər"ə olan maraqları, özlərindən əvvəl başlamış olan maddi mədəniyyət ünsürlərini toplayan və alman əntiqlərini toplama adəti ilə birləşərək bir tərkib halına gəlir. Qrimlər 1812-ci ildə tanınmış "Ev və pəri nağılları" adlı nağıl kitabını nəşr etdirirlər. Bu iş müvafiq sahə üçün bir standart olma xüsusiyyətini özündə əks etdirir. Bu dövrdən etibarən onların davamçıları ilə birlikdə oxşar işlər görülmüş və görülən işlərdə toplanmış materialların parallelərinin göstərilməsi, onlara qeydlər və izahlar verilməklə nəşr olunması metodu inkişaf etməyə başlamışdır.

Bu metodu götürərək daha da genişləndirən skandinavyalıların, xüsusilə, finlandiyalı folklorşünasların işlərinin nəticəsində "Tarixi və coğrafi Fin metodu" olaraq məlum olan metod meydana gəlir. Almanyada Qrim qardaşları ilə birlikdə mətn toplayan və nəşr etdirən folklorçular gördükləri işi "volkskunde" (xalq ədəbiyyatı) olaraq adlandırırdılar. 1890-ci ildə "Verein für Volkskunde" adlı xalq ədəbiyyatı materialları və qiymətləndirmə işlərini görən və qısa zamanda Almanyanın hər yerinə yayılan dərnək qurulur. Bu cür sistemli araşdırmaların nəticəsi olaraq bu gün dünyadakı ən böyük folklor arxivi – almanların "Deutsches Volksliend Archiv at freiburg Breusgaus" adlı xalq mədəniyyəti arxividir.

Bu gün Almaniyada akademik, bürokratik, siyasi həyatda və universitetlərdə xalqa, xalq yaradıcılığına, folklora verilən yer hələ indiyədək dünyanın heç bir ölkəsində verilməmişdir. Almanlar folkloru xalqın keçmişi, ruhu, toplu olaraq, yəni xalq bilikləri kimi qəbul etməkdədirlər. Alman universitetlərində sosiologiya, psixologiya və siyasi elmləri folklorun bir növü və ya qolu

olaraq qəbul edirlər və təhsil buna görə qurulur. Qısaca desək, Almaniyada bu gün folklor təhsil və tədrisin, siyasi elmlərin və beynəlxalq əlaqələr bölmələrinin siyasi və mədəni siyasətin qaynağı və təməli olaraq qəbul edilməkdədir.

Malinovskinin 1926-cı ildə nəşr etdirdiyi "İbtidai psixologiyada mif" (Myth in Primifive Psyhology) adlı əsərində (1926; 1954) "məzmun" (context) və "icra" (performance) məfhumları başda olmaqla verdiyi tərifin tətbiqi və bunların funksional əhəmiyyətlərini ortaya qoyan hallərə görə 1970-ci illərdə ortaya çıxan "Performans nəzəriyyə"nin istifadə etdiyi bəzi nəzəri əsasların qurucularından biri və ya V. Bakomun təsiri ilə aşağıda üzərində duracağımız və R. M. Dorsonun ifadəsi ilə "Gənc türklər" (Young Turks) qrupu Amerika folklorşünaslarının da öndə gələnlərindəndir.

Malinovskiyə görə, mədəniyyət "açıqca alətlərin və istehlakın müxtəlif ictimai qruplaşmalar üçün həyata keçirilən qanuni sənətlərdən, insana aid düşüncə və bacarıqlardan, inanc və ənənələrdən ibarət olan bir külliyatdır". Biz ibtidai mədəniyyəti belə araşdırsaq, orada qismən maddi, qismən insana aid, qismən də mənəvi ehtiyatlarla qarşılaşacağıq. Elə bu ehtiyatlar insanın üzləşdiyi konkret və şəxsi problemlərinin öhdəsindən gələ bilər. Bu prolemlər insanın təbii ehtiyaclarından və mühitindən qaynaqlanır (Çobanoğlu, 2002, s. 78).

Foklor həm dar, həm də geniş mənada başa düşülür. Dar mənada folklor "şifahi xalq yaradıcılığı" və ya bəzən də "şifahi xalq ədəbiyyatı" kimi başa düşülür. Daha çox türk xalqlarının filologiyasında rastlanan "xalq ədəbiyyatı" (halk edebiyatı), əslində, xalq yaradıcılığının bədii mətnərinin yalnız şifahi, sözlü hissəsini əhatə edə bilir. Türkiyədə "folklor" daha çox xalq yardıcılığının anonim "xalq musiqisi" hissəsinə aid edilərək, o sahəni bildirən termin kimi işlədilməkdədir. Rus filologiyasında "folklor" "narodnoe ustnoe poetiçeskoe tvorçestvo" (şifahi xalq poetik yaradıcılığı) və ya "narodnoe poetiçeskoe tvorçestvo" (poetik xalq yaradıcılığı) kimi elmi ədəbiyyatlarda öz əksini tapır. Azərbaycan filologiyasının qaynağı, türk və rus filologiyaları ilə sıx təmasda olduğundan, "folklor" termininin elmi dövriyyəyə daxil edilməsi və formalaşması da qeyd olunan qaynaqlarla bağlı olaraq müəyyənləşmişdir. Çünki "Azərbaycan şifahi xalq ədəbiyyatı" adı bu gerçəkliyi özündə əks etdirir.

Folklor termini öz vətəni İngiltərədə və ingilisdilli olan Amerika Birləşmiş Ştatlarında olduqca geniş mənada işlədilməkdədir. Terminin əhatə dairəsinə xalq sənətinin bütün növləri – poeziya, musiqi, rəqslər, oyunlar, təsviri sənət, inamlar, adətlər və s. daxildir.

Folklorun əsas səciyyəsi müəyyənləşdirilərkən mədəniyyətin tipi olmaq etibarilə şifahilik əsas götürülmüşdür.

XX əsrin əvvəllərində (1920-1930-cu illər) Azərbaycan xalq yaradıcılığı nümunələri üzərində aparılan araşdırmalarda da bu mədəniyytin əsasını təşkil edən fəaliyyət sahəsinin terminologiyasının müəyyənləşdirilməsinə təşəbbüslər göstərilmişdir. Bu, xüsusilə xalq yaradıcılığının öyrənilməsində geniş fəaliyyəti olan folklorçu alim Hənəfi Zeynallının araşdırmalarında müşahidə olunur. "Xalq yaradıcılığı"nın terminoloji əsaslarını, anlayışların semantik əhatəsini və terminlərin təyinatını müəyyənləşdirmək üçün ayrıca araşdırmalar aparmış və bu problemə məqalə həsr etmişdir. Məqalədən aydın olur ki, alim "folklor" üçün uyğun terminləri bir araya gətirmiş və onları təhlil etmişdir. Bunların içərisində "ağız ədəbiyyatı", "el ədəbiyyatı", "xalq ədəbiyyatı", "xəlqiyyat" kimi terminlər nəzərdən keçirilmiş, "ağız ədəbiyyatı" (şifahi ədəbiyyat) ilə "kağız ədəbiyyatı"nın (yazılı ədəbiyyat) arasında olan köklü fərqlər elmi əsaslarla izah edilmişdir (Əfəndiyev, 1992, s. 89).

Azərbaycanda Sovet dönəmində hazırlanan folklor dərsliklərində də əsrin əvvəllərindəki ənənə davam etdirilmiş, xalq yaradıcılığı mənasında "Azərbaycan şifahi xalq ədəbiyyatı", (V. Vəliyev və P. Əfəndiyev) və "Azərbaycan folkloru" (V. Vəliyev) terminlərindən istifadə olunmuşdur. Müstəqillik dönəmində hazırlanan dərsliklərdə isə "Azərbaycan xalq ədəbiyyatı" (A. Nəbiyev) adı seçilmişdir.

Azərbaycan xalq yaradıcılığı olduqca geniş əhatə dairəsinə malikdir. Bunun içərisində zəngin milli mədəni miras vardır. Bu mədəni irs maddi (cızma, oyma, döymə, çəkmə, hörmə, tikmə, toxuma, yemək, geyim və s.) və qeyri-maddi (rituallar, oyunlar, rəqslər, musiqi, mərasim, şeir, sənət və s.) olmaqla iki yerə ayrılır. Milli mədəni irs nümunələrinə, əsasən, anonim, müəllifi məlum olmayan xalq yaradıcılıq nümunələri daxildir. Burada peşəkar folklor söyləyiciləri (məsələn,

Avropada turbaturlar, slavyan kobzarı, Azərbaycan aşığı və s.) istisnalıq təşkil edir. Yəni sənətçi məlum olduğu halda yaradıcılıq fəaliyyəti folklor hadisəsi sayılır. Çünki onun yaradıcılığı ənənəvidir və xalq yaradıcılığının modellər üzərində qurulmuşdur, təkrarlanan, xalq yaradıcılığını yayan və yaşadan folklor hadisəsidir.

Ənənəvi xalq yaradıcılığı nümunələri qeyri-maddi mədəni irsin əsas hissəsini təşkil etməkdədir. Şifahi xalq yaradıcılığı da bu sahəyə aiddir. Azərbaycan şifahi xalq yaradıcılığı özündə şifahi yaradıcılığın rəngarəng janrlarını birləşdirir. Buraya mərasim folkloru, oyun folkloru, alqışlar, andlar, qarğışlar, sınamalar, ovsunlar, laylalar, sayaçı sözlər, holavarlar, bayatılar, ağılar, atalar sözləri, tapmacalar, əsatirlər, əfsanələr, rəvayətlər, lətifələr, qaravəllilər, nağıllar, dastanlar, xalq tamaşaları, aşıq yaradıcılığı və s. daxildir.

Folklor qədim mədəniyyət mənasında da başa düşülür. İnsanın mədəni fəaliyyəti geniş, çoxsahəli və rəngarəngdir. Bəşəriyyətin ən ibtidai dövrlərindən başlayaraq insan fəaliyyətinin müxtəlif mədəni təmayülləri mövcud olub. İbtidai cəmiyyətlərdə insanların həyatı təbiətlə, onun ayrı-ayrı təzahürləri ilə sıx şəkildə bağlı olub. Təbiətlə iç-içə yaşayan insan öz təbii, ilkin mədəniyyətini təbiətdən götürüb. Təqlid yolu ilə ona təsir etməyə çalışıb, təbiətin ritmlərini öz həyat ritmlərində təkrarlayıb. Təbiətin və onun bir hissəsi olan insanın genetik kodlarını, həyat və davranış formullarını müəyyənləşdirən ilahi başlanğıc həm təbii həyat ritmlərinin, həm ondan yaranan mədəniyyətin əsasını təşkil edir (Gökdəmir Gönül, 2003, s. 87).

Təbiətdə olduğu kimi, insan həyatının da ritmik strukturları, ilahi tamlığı tamamlayan harmoniyanın Tanrı tərəfindən kodlaşdırılmış, proqramlaşdırılmış mümkün fəaliyyət sferası mövcuddur. İnsanın mədəni fəaliyyətinə universal yanaşmada ibtidai mədəniyyətin daha çox təbii olduğu və öz təbii estetizmi ilə seçildiyi həqiqəti ilə qarşılaşırıq. Təbii mədəniyyət insanın təbii həyatıdır, onun dünya ilə münasibətləri və davranışlarıdır. İnsan doğulur, böyüyür, yaşa dolur, qocalır və ölür. İnsan bütün ömrü boyu kiçik və böyük detalları ilə eyni və ya oxşar situasiyalardan keçir. İnsan qida əldə edir, yeyir, içir-sevinir; ac qalır, ağrıyır, xəstələnir-kədərlənir. İnsan təbiət hadisələrinə heç zaman laqeyd qalmır; xoş hava, xoş ovqat doğurur; gündüz sevinc gətirir, gecə kədər. Əski dövrlərə getdikcə insanın həyatında təbiətin rolu çoxalır. İnsan psixologiyasının bir çox strukturları da təbiətə, onun təzahürlərinə qorxu, vahimə, heyrət, təəccüb, sevinc hisslərindən yaranıb. Əski görüşlərin, əski inancların, əski davranışların əsası ordan başlanır. Ora Tanrının yaratdığı təbiətin və təbii mədəniyyətin özüdür.

İbtidai insanın düşüncəsi də ibtidai düşüncədir. Bu düşüncə dual sistemli mexanizmi ilə xarakterizə olunur. Sistemin binar strukturu xaos – kosmos modelində gerçəkləşir. Düşüncənin bu tipi dünyanı xaos – kosmos qarşıdurmasında dərk edir. Dünya bütün strukturları ilə ikiyə bölünür; təsəvvürdə və təsəvvürün yardımı ilə yaranan elementlər bu qütblər ətrafında qruplaşır. Bu düşüncə başlanğıca aid olan hər şeyi müqəddəs sayır. İnsan da, məkan da, zaman da başlanğıcda sakral (müqəddəs) olur və qapalı şəkildə təkrarlanır. Düşüncə qapalı sistemdən çıxdıqda dolanan təkrar hərəkət yayvari şəkil alır və hər dəfə bir boy böyüyür, irəliyə doğru can atır və getdikcə öz sakral başlanğıcından uzaqlaşır və daha çox profan (adi) xarakter daşıyır (Gökyay Orhan Şaik, 2000).

İbtidai mədəniyyətin əsasında xaos – kosmos düşüncəsi və sakral – profan münasibəti durur. Düşüncənin və davranışın struktur əsası budur. Düşüncənin mifdən, hərəkətin, münasibətin arxaik ritualdan ayrılması, kosmoloji çağın bitməsi ilə ibtidai mədəniyyətdən onun strukturlarının transformasiya olunduğu və çeşidli paradiqmalar doğurduğu süni, mütəşəkkil mədəniyyətə keçid başlanır.

İbtidai mədəniyyət proqram potensialına görə sonrakı təzahür imkanlarının məcmusunu özündə ehtiva edir. Yəni o özünün ən sadə, bəsit və ibtidai formasında belə kifayət qədər yüksək və özündən sonrakı inkişafın bütün potensialını nüvəsində yerləşdirən, açıldıqca açılan, genişləndikcə genişlənən və heç zaman özünün ilkin başlanğıcındakı kod, məlumat və sxem səviyyələrindən heç olmazsa biri ilə genetik struktur əlaqəsini itirməyən, davamlı, fasiləsiz və mürəkkəb sistemdir.

Folklor söz sənətidir. Terminin izahından və bura daxil olan janrların xarakterindən də göründüyü kimi, şifahi xalq yaradıcılığı və ya folklor söz sənətidir. Bütün janrlarda söz əsas ifadə rolunu yerinə yetirir. Bəzi janrlarda (əmək nəğmələri, xalq mahnıları və s.) isə buraya musiqi xarakterli ifadə vasitələri də daxil olur. Məlumdur ki, ədəbiyyat da söz sənətidir. Təbii ki, o zaman

folklorun bədii ədəbiyyatdan fərqini izah etmək zərurəti yaranır. Folklor ədəbiyyatdan öz sosial təbiəti, həyati məzmunu, ideya mahiyyəti və bədii özünəməxsusluğu ilə fərqlənir.

Folklorun sosial təbiəti, ilk növbədə, ifadə etdiyi xəlqi məna ilə müəyyənləşir. Çünki xalq sözü həm "şifahi xalq yaradıcılığı"nda, həm də "folklor"da (folk-xalq) işlənməkdədir. Xalq anlayışı bu yaradıcılıq formasının sosial mahiyyətini və xüsusi sosial təbiətini diqqət mərkəzinə gətirir. Folklor xalq tərəfindən və xalq üçün yaradılan yaradıcılıqdır.

Folklorşünaslıqda folklorla ictimai məzmun arasındakı əlaqələrin üç tipini ayırırlar: sahibiyət, təmsil etmə, yaratma və ya yenidən yaratma. Sadəcə, "folklor" termininin tam bir şərhi, ilk əlaqə tipini qurur. Buna görə folklor "insanların öyrənməsi", "insanların müdrikliyi, insanlara aid məlumat" və ya daha doğru olaraq, "elm, geniş məlumat və ya bir xalqın öyrənməsi"dir. Folkloru müştərək bir qrupun hamısı tərəfindən paylaşılan bir elm olaraq görən bu baxış, praktikada və nəzəriyyədə, xalqın sahibliyinin fərqli dərəcələrinə tətbiq olunur (Çobanoğlu, 2002, s. 56).

Birincisi, folklor bir cəmiyyətdəki məlumatın hamısı ola bilər. Cəmiyyət üzvlərindən heç biri, o cəmiyyət dəyərlərinin hamısına tam şəkildə malik olmadığı üçün bu mənada folklor çoxları tərəfindən toplanmış, "insanların ənənəvi inancları və adətlərinin hamısının bütövü", kollektiv məlumat üzərində qurulmuş və mücərrəd olmaq məcburiyyətindədir.

İkincisi və əksi, folklor yalnız qrup üzvlərinin hər biri tərəfindən paylaşılan məlumat olaraq göz önünə alınmışdır. Bu tərif hər hansı bir xüsusi məlumatı kənarlaşdırır və ona yalnız bir cəmiyyətdəki seçilmiş mütəxəssislər yiyələnə bilərlər. Çünki bu tərif folkloru sadəcə "məşhur məlumat" şəklində məhdudlaşdırır. Bu vəziyyətdə folklor cəmiyyətin gerçək ortaq malı olar (Boratav, 1973, s. 78).

Üçüncüsü, Freyzerin tərif etdiyi kimi, bu gerçək ortaq bilik bütün imtiyazlarla cəmiyyətin bütün üzvlərinin iştirak etdiyi folklor tədbirləri, rituallar və mərasimlər daxil olmaqla "xalq kütlələrinin ortaq hərəkətlərində" bütun imtiyazları ilə ifadə edilə bilər.

Son olaraq, folklor cəmiyyətdəki hər bir şəxsin öz evinin və ailəsinin bağlı olduğu ənənə və adətlər sayəsində ona itaət etmələridir. Bu son şərh hər nə qədər nəzəri olaraq mümkünsə də, folklorun mühitini bu qədər dar olaraq təyin edən heç bir tərif mövcud deyil.

Folklor və onun ictimai məzmunu arasında meydana gələn əlaqələrdəki ikinci dəstənin quruluşu, İngilis Təkamül nəzəriyyəsi və Fransız ictimai antropologiyası üzərinə qurulmuşdur. Buna görə folklor xüsusi bir ortaq tərz və eyni vaxtda formalaşan düşüncəni Andre Varacnak tərifindən qeyd edildiyi kimi: "Folklor, nəzəriyyəsiz kollektiv praktikalar, doktrinasız kollektiv inanışların hamısını təmsil edir". Bu vəziyyətdə, gerçək ənənələr, rituallar və digər adətlər onların əsasını təşkil edən düşüncə tərzinin nümayəndələridir.

Folklorun sosial təbiətini aydın təsəvvür etmək üçün onun tarixi-mədəni aspektini də diqqətdə saxlamaq lazımdır. Çünki folklor zamanla sıx bağlıdır. İbtidai cəmiyyət dövründə folklor qəbilə və tayfa yaradıcılığını ifadə edir. İlkin kollektivlik və sosiallıq öz başlanğıcını buradan başlayır. Folklorun sonrakı inkişafı tarixində də müxtəlif dövrlərin sosial qruplarının yaradıcılığı bu prosesə daxil olur və onu tarixi və sosial-mədəni elementlərlə zənginləşdirir (Albayrak Nurettin, 2004).

## Nəticə

Tayfa mədəniyyəti dövrünün yaradıcılığı folklorda öz izlərini bu və ya başqa şəkildə saxlamaqdadır. "Soylama" qəbilə (soy) dövrünün, "boylama" (boy) tayfa dövrünün yaradıcılıq nümunəsi kimi orta çağ ozan ifasına və yazı ənənsinə daxil olmuş və "Dədə Qorqud kitabı"nda yazıya alınmışdır. Ata sözləri, bay ayıtları (bayatılar) da türk mədəniyyətində "Ata"nın və "Bay"ın daşıdığı sosial funksiyanı bir şəkildə ifadə etməkdədir. Əski türk cəmiyyəti Atası (cəmiyyətin mənəvi rəhbəri), Bayı (cəmiyyətin ruhani rəhbəri), Ozanı (söyləyicisi), Xanı (siyasi rəhbəri), Eli (xalqı, sosial təşkilatı və dövləti) olan səciyyəvi və ya özünəməxsus bir cəmiyyətdir. Bu cəmiyyətin şifahi yaradıcılığı türk xalqları folklorunun əsaslarını formalaşdırır. Azərbaycan folklorunun əsasında da bu gerçəklik dayanmaqdadır. Azərbaycan folklorunun sosial təbiəti ən qədim zamanlardan başlayaraq onun yaradılmasında iştirak edən istedadlı insanların, müxtəlif sosial qruplara aid olan zümrələrin yaradıcılıq fəaliyyətləri ilə müəyyənləşir. Azərbaycan folklorunun janrları Azərbaycan xalqının tarixi, iqtisadi, mədəni və mənəvi gerçəkliyini əks etdirməkdədir.

Sayaçı sözləri, holavarlar və s. azərbaycanlıların təsərrüfat həyatını, laylalar ailə-məişət reallığını, atalar sözləri atanın sosial statusunu, bay ayıtları (bayatılar) mənəvi münasibətləri və s. ifadə etməkdədir. Azərbaycan folklorunun sosial təbiətinin müəyyənləşməsində daha çox atalar, bəylər, analar, uşaqlar və aşıqlar iştirak edirlər. Folklor janrlarının hər birində xalq həyatının bir gerçəkliyi, doğumu, inancı, oyunu-əyləncəsi, adət-ənənəsi, toy-düyünü, xeyir-şəri, yası və s. vardır.

Beləliklə, folklor həm həyatı, həm də sənəti gözəlləşdirir. Xalq yaradıcılığının estetikası üçün gözəlliyin təbiətdə və insanda, estetiklə əxlaqın, real və xəyalinin vəhdətində, aydın ifadəylə açıqlanması xarakerikdir.

Folklor əsərlərinin bədii əhəmiyyəti və effekti onun dinləyicilərə verdiyi estetik zövqlə müəyyənləşir.

## Ədəbiyyat

1. Albayrak, N. (2004). *Ant. Ensklopedik türk xalq ədəbiyyatı terminləri.*
2. Boratav, P. N. (1973). *Türk folkloru mənbələri.*
3. Çobanoğlu, Ö. (2002). *Xalqbilimi quramaları ve araşdırma yöntəmləri tarixinə giriş*. Akçağ.
4. Damici, R. (1952). Azəri türklərində niyyət və bəxt və ölüm və şəbəkə. *TFA*, 2, 32, 509-510.
5. Dorson, M. R. (1955). İngilis folklorşünasın ilk qrupu. *Amerika folkloru jurnalı*, 64, 267.
6. Əfəndiyev, P. (1992). *Azərbaycan şifahi xalq ədəbiyyatı* (dərslik).
7. Gökyay, O. Ş. (2000). *Dədəm Qorqudun Kitabı.*
8. Gökdəmir, G. (2003). Türk mifologiyasının əsasları. *Milli Folklor*, 60 (Kış), 60-72; TDEA, 1, 136-137.

Daxil oldu: 05.09.2024
Baxışa göndərildi: 26.09.2024
Təsdiq edildi: 11.10.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/52-55

**Leyla Hüseynzadə**
Bakı Biznes Universiteti
magistrant
huseynzadeleyla19@gmail.com

# Bankların maliyyə möhkəmliyinin təhlilinin nəzəri-metoroloji aspektləri

**Xülasə**

Məqalənin məqsədi kommersiya banklarının maliyyə sabitliyinin mahiyyətini, qiymətləndirilməsinin göstəricilər sistemini öyrənmək və əsaslandırmaq, həmçinin onların üstünlüklərini və çatışmazlıqlarını müəyyən etməkdir.

Məqalədə kommersiya banklarının maliyyə sabitliyinin makro və mikro aspektdə əhəmiyyəti tədqiq edilmiş və bu aspektdə onların davamlı inkişafının vacibliyi vurğulanmışdır.

Maliyyə sabitliyinə iqtisadi ədəbiyyatlarda olan elmi yanaşmalar təhlil edilmiş və müxtəlif nəzəri mənbələr əsasında maliyyə sabitliyi anlayışına yanaşmalar ümumiləşdirilmişdir. Aparılan tədqiqt əsasında bankların maliyyə sabitliyinin təhlili edilməsinin kompleks göstəricilər sistemi təklif edilmişdir.

***Açar sözlər:*** *bank, maliyyə sabitliyi, Mərkəzi Bank, göstəricilər sistemi, maliyyə sabitliyinin təhlili*

**Leyla Huseynzade**
Baku Business University
Master student
huseynzadeleyla19@gmail.com

# Theoretical-Meteorological Aspects of the Analysis of Financial Strength of Banks

**Abstract**

The purpose of the article is to study and justify the essence of financial stability of commercial banks, the system of indicators for evaluation, as well as to determine their advantages and disadvantages.

In the article, the importance of the financial stability of commercial banks in macro and micro aspects was studied and the importance of their continuous development was emphasized in this aspect.

Scientific approaches to financial stability in economic literature were analyzed and approaches to the concept of financial stability were summarized based on various theoretical sources. Based on the conducted research, a complex system of indicators for analyzing the financial stability of banks was proposed.

***Keywords:*** *bank, financial stability, Central Bank, indicator system, analysis of financial stability*

## Giriş

İqitisad elminin inkişaf tarixində müxtəlif nəzəriyyələr formalaşmış və inkişaf etmişdir. Məlum məsələdir ki, hər bir nəzəriyyənin yaradıcıları və inkişafını təmin edən məktəblər formalaşmışdır. Belə fundamental və iqtisadçılar arasında geniş müzakirələrə səbəb olan, eyni zamanda yeni nəzəriyyələrin və iqtisadi məktəblərin formalaşmasına təkan verən tədqiqat obyektlərindən biri də bankların fəaliyyət səmərəliliyinin qiymətləndirilməsidir. Bank sferasında fəaliyyət səmərəliliyi onun vəsaitlərindən səmərəli istifadəsində və bütövlükdə maliyyə sabitliyinin təmin edilməsində öz əksini tapır ("Banklar haqqında" Azərbaycan Respublikasının Qanunu, 16.01.2004).

 

Azərbaycan Respublikasının müstəqilliyi təmin edildikdən sonra müasir iqtisadiyyatının mühüm xüsusiyyəti pul, kredit sektorlarının inteqrasiyaya və vahid milli maliyyə bazarın formalaşması olmuşdur. Belə ki, iqtisadi müstəqillik və müxtəlif mülkiyyətli müəssisələrin formalaşması bütövlükdə milli iqtisadiyyatın maliyyələşdirilməsində müxtəlif mənbə və maliyyə alətlərinə olan tələbat milli maliyyə bazarının formalaşmasını zəruri etmişdir ("Bank olmayan kredit təşkilatları haqqında" Azərbaycan Respublikasının Qanunu, 25.12.2009).

**Tədqiqat**

Maliyyə sistemi daxilində əsas rola malik qurumlar banklardır. Bazar münasibətlərinə əsaslanan ölkələrdə bank sistemi ikipilləli – Mərkəzi Bank və kommersiya bankları sistemindən ibarət olmaqla fiziki və hüquqi şəxslərdən depozitlərin və ya digər qaytarılan vəsaitlərin cəlb edilməsi, öz adından və öz hesabına kreditlərin verilməsini, habelə müştərilərin tapşırığı ilə köçürmə və hesablaşma-kassa əməliyyatlarını məcmu halda həyata keçirən hüquqi şəxsdir (Sadıqov, 2012, m.1).

Belə ki, ölkəmizdə 2019-cu ilin sonuna ümumi kredit portfeli 14900,9 milyon manat olmuşdursa, eyni göstərici 2024-cü ilin fevral ayına 23833,0 milyon manat təşkil etmişdir.

**Cədvəl 1.**
**Bankların kredit portfelinin strukturu barədə məlumat (milyon manatla)**

| **Portfelin bölgüsü** | 31.12.19 | 31.12.20 | 31.12.21 | 31.12.22 | 31.12.23 | 31.01.24 | 29.02.24 |
|---|---|---|---|---|---|---|---|
| Kredit portfeli | 14.900,9 | 14.157,0 | 16.659,1 | 19.594,4 | 23.183,0 | 23.566,4 | 23.833,0 |
| Biznes kreditləri | 9.031,6 | 8.478,3 | 9.740,0 | 10.855,1 | 12.616,8 | 12.912,9 | 13.063,7 |
| İstehlak kreditləri | 4.075,3 | 3.661,2 | 4.518,4 | 5.754,1 | 6.937,0 | 7.008,0 | 7.077,3 |
| İpoteka kreditləri | 1.794,0 | 2.017,5 | 2.400,7 | 2.985,2 | 3.629,2 | 3.645,5 | 3.692,0 |

*Mənbə: https://www.cbar.az/page-188/credit-institutions*

Beləliklə, milli iqtisadiyyatın inkişafında bankların rolu onların davamlı fəaliyyətinin təmin edilməsinin vacibliyini göstərir. Bu baxımdan kommersiya banklarının fəaliyyətinin öyrənilməsi və onların maliyyə sabitliyinin müasir yanaşmalar əsasında qiymətləndirilməsi vacibdir.

Bazar iqtisadiyyatı şəraitində kommersiya bankının maliyyə sabitliyi onun rəqabət qabiliyyətinin qiymətləndirilməsində ən vacib amillərdən biridir. Bankın maliyyə möhkəmliyi nə qədər yüksəkdirsə, bazar şərtlərindəki gözlənilməz dəyişikliklərdən bir o qədər müstəqildir (Məhərrəmov və b., 2019, s. 688).

Bütün bunlar bank sferasında maliyyə möhkəmliyinin iqtisadi kategoriya kimi mahiyyətinin və nəzəri əsasların öyrənilməsini, onun təhlili mertodikasının əsaslandırılmasını zəruri edir (Məmmədov, 2015, s. 325).

Bütövlükdə, maliyyə möhkəmliyinin mahiyyətini dolğun və hərtərəfli tədqiq etmək və mövcud nəzəri yanaşmaları ümumiləşdirməklə tərif vermək üçün müxtəlif iqtisadçıların nəzəri fikirlərinin müqayisəli öyrənilməsinə ehtiyac var.

V. V. Kovalev və O. N. Volkova görə, maliyyə vəziyyətinin ən vacib xüsusiyyətlərindən biri, fəaliyyətinin uzunmüddətli perspektiv baxımından sabitliyidir (Bogdanovskaya, 2004, s. 35-48). Müəssisənin ümumi maliyyə quruluşu, kreditorlardan və investorlardan asılılıq dərəcəsi ilə əlaqələndirilir. Nəticə etibarilə, maliyyə sabitliyi xüsusi və borc vəsaitlərinin nisbəti ilə xarakterizə olunur.

V. V. Kovalevə görə, müəssisənin əmlak vəziyyətinin təhlilini nəzərə alaraq, maliyyə vəziyyətinin dayanıqlı olması, əsasən, maliyyə mənbələrini aktivlərə yatırmanın məqsədəuyğunluğundan və düzgünlüyündən asılıdır (Kovalev, 2006, s. 428-438).

B. M. Rodionova görə, xüsusi dövriyyə vəsaitlərinin mövcudluğu, onların təhlükəsizliyi, xüsusi və borclanan dövriyyə vəsaitləri arasındakı nisbət müəssisənin maliyyə dayanıqlığını, maliyyə bazarındakı mövqeyini, qiymətli kağızlar çıxarmaqla resursların əlavə səfərbər olma imkanlarını xarakterizə edir (Rodionova, 2005, s. 291-293).

V.V. Boçarova görə maliyyə sabitliyi iqtisadi qurumun maliyyə dayanıqlığı onun pul ehtiyatlarının vəziyyətini xarakterizə edən, ödəmə qabiliyyətini və kredit ödəmə qabiliyyətini minimum sahibkarlıq riski səviyyəsində saxlayaraq əsasən öz hesabına müəssisəni inkişaf etdirməyi təmin edən bir vəziyyətdir (Bocharov, 2005, s. 10-13).

L. A. Bogdanovskaya, G. G. Vinogradov müəssisənin maliyyə sabitliyi konsepsiyası perspektivli ödəmə qabiliyyəti ilə əlaqələndirilir. Maliyyə sabitliyinin qiymətləndirilməsi xarici təhlil subyektlərinə (xüsusilə investorlara) müəssisənin uzun müddətə maliyyə imkanlarını müəyyənləşdirməyə imkan verir. Bazar iqtisadiyyatı şəraitində istehsal prosesinin həyata keçirilməsi, genişləndirilməsi, müəssisənin müxtəlif ehtiyaclarının ödənilməsi öz vəsaitləri hesabına və çatışmazlığı halında borc vəsaitləri hesabına həyata keçirildiyi üçün xarici borc mənbələri böyük əhəmiyyət kəsb edir, baxmayaraq ki, bunlar olmadan etmək çətindir... Buna görə borc, kapital və məcmu kapital nisbətləri müxtəlif mövqelərdən öyrənilir (Sadıqov, 2010, s. 222; Bogdanovskaya et al., 2004, s. 35-48).

Yuxarıda qeyd olunan fikirlərə əsaslanaraq deyə bilərik ki, "maliyyə sabitliyi" konsepsiyasının məzmununa dair müxtəlif baxışların təhlili göstərir ki, tədqiq olunan problemlə bağlı müxtəlif müəlliflərin ümumi baxışı yoxdur. Onların əksəriyyəti maliyyə möhkəmliyini bir və ya iki göstəricidə ifadə edərək maliyyə möhkəmliyini lazım olduğundan daha dar şəkildə təmsil edirlər. Amma maliyyə davamlılığının çoxölçülü bir iqtisadi fenomen olduğu bəllidir, buna görə o göstəricilər sistemi ilə ifadə olunmalıdır (Müslümov, Kazımov, 2012, s. 246).

Yuxarıda göstərilənləri nəzərə alaraq qeyd etmək istərdim ki, müxtəlif amillər qruplarının qarşılıqlı əlaqəsi və bir-birindən asılılığı belə nəticəyə gəlməyə imkan verir ki, yalnız bankın fəaliyyətini xarakterizə edən bütün göstəricilərin kompleks sistemli istifadəsi ilə onun fəaliyyətini və maliyyə sabitliyini səmərəli qiymətləndirmək olar (Melnik, 2006, s. 352).

Bankların maliyyə sabitliyi mövzusunun aktuallığı kommersiya bankının fəaliyyətinin qiymətləndirilməsində onun maliyyə sabitliyinin müəyyən edilməsinin əsas rol oynaması ilə bağlıdır. Bankın rifahı, inkişafın stimullaşdırılmasına yönəlmiş ehtiyat vəsaitlərinin formalaşması, rəqabət qabiliyyəti və əlavə resurslar cəlb etmək imkanları bankın maliyyə sabitliyinin dəqiq müəyyən edilməsindən və proqnozlaşdırılmasından asılıdır (Sadıqov, 2010, s. 212-213).

Kredit təşkilatının maliyyə sabitliyinin planlaşdırılmasında və müəyyən edilməsində təkcə bankın özü deyil, həm də onun səhmdarları və müştəriləri kimi iştirakçılar və ilk növbədə dövlət maraqlıdır. Onlar üçün kredit təşkilatlarının maliyyə sabitliyi iqtisadi maraqlarının və özlərinin rifahının təminatıdır.

Kommersiya banklarının maliyyə sabitliyinə həm dar mənada, yəni bankın likvidliyi, ödəmə qabiliyyəti və etibarlılığı, həm də geniş mənada, yəni müxtəlif əlverişsiz amillərə məruz qaldıqdan sonra bank fəaliyyətinin sabitləşməsi kimi baxıla bilər (Rokhmanova & Lyukevich, 2016, s. 469-471). Sonuncu həm də kredit təşkilatının əvvəlki vəziyyətinə qayıtmaq, öz funksiyalarını yerinə yetirməkdə davam etmək, məqsədlərinə nail olmaq qabiliyyəti kimi də şərh edilə bilər.

İqtisadi ədəbiyyatlarda bankların maliyyə sabitliyinin təhlili üçün bir çox müəllif metodları hazırlanmışdır ki, onların hamısını bank fəaliyyətinin əsas komponentlərinin – keyfiyyət, likvidlik və gəlirliliyin müvafiq səviyyəsini müəyyən etmək məqsədi birləşdirir.

Maliyyə sabitliyini qiymətləndirmək üçün müasir metodların tədqiqi onu deməyə əsas verir ki, Mərkəzi Bankın metodologiyası bank sferasında baş verən dəyişikliyə uyğunluğu baxımından daha məqsədəuyğun hesab edilir (Bakhareva, 2016, s. 136-140).

Bu gün bank sahəsində kommersiya banklarının maliyyə sabitliyinin qiymətləndirilməsi üçün bir çox metodikalar geniş yayılmışdır. Onların hamısını tədqiq edib təhlil etdikdən sonra iki növə

bölmək olar: ənənəvi üsullar və beynəlxalq aləmdə geniş yayılan üsullar. Ənənəvi metodları da öz növbəsində hüquqi tələblər və reyting agentliklərinin qiymətləndirmə üsullarına bölmək olar (Fetisov, 2014, s. 168).

## Nəticə

Bütövlükdə, aparıalan tədqiqat onu deməyə əsas verir ki, bankların maliyyə sabitliyinin təhlilində kompleks göstəricilər sistemindən istifadə olunması məqsədəuyğundur. Bu göstəricilərə aşağıdakıları aid etmək olar:

- kapital göstəriciləri;
- aktivlərin göstəriciləri;
- gəlirlilik göstəriciləri;
- likvidlik göstəriciləri;
- faiz dərəcəsi riski göstəriciləri;
- konsentrasiya riski göstəriciləri;
- bankın idarə edilməsinin keyfiyyəti, onun əməliyyatları və riskləri;
- bankın mülkiyyət strukturunun şəffaflığının keyfiyyəti.

## Ədəbiyyat

1. “Banklar haqqında” Azərbaycan Respublikasının Qanunu. (16.01.2004).
2. “Bank olmayan kredit təşkilatları haqqında” Azərbaycan Respublikasının Qanunu. (25.12.2009).
3. Məhərrəmov, A. M., Qarayev, F. M., Sarıyev, K. A., Tağıyev, M. R., Abışov, L. V. (2019). *Bank işi.*
4. Məmmədov, Z. F. (2015). *Bank fəaliyyətinin əsasları* (dərs vəsaiti).
5. Müslümov, S. Y., Kazımov, R. N. (2012). *Maliyyə təhlili* (dərslik). CBS.
6. Sadıqov, Ə. A. (2012). *Mühasibat uçotu* (dərslik).
7. Sadıqov, E. M. (2010). *Bank əməliyyatları* (dərs vəsaiti).
8. Sadıqov, E. M. (2010). *Bank əməliyyatları* (dərs vəsaiti). “İqtisad Universiteti” Nəşriyyatı.
9. Bocharov, V. V. (2005). *Fiansovyy analiz* (uchebnoye posobiye). Piter.
10. Bakhareva, A. A., & Mokrova, L. P. (2016). *Preimushchestva i nedostatki metodik otsenki finansovoy ustoychivosti kommercheskikh bankov*, 6, 136-140.
11. Bogdanovskaya, L. A., Vinogradov, G. G., Migun, O. F., & Strazheva, V. I. (2004). *Analiz khozyaystvennoy deyatel'nosti v promyshlennosti*. Vysshaya shkola.
12. Fetisov, G. G. (2014). *Ustoychivost' kommercheskogo banka i reytingovyye sistemy yeye otsenki.* Finansy i statistika.
13. Kovalev, V. V. (2006). *Analiz khozyaystvennoy deyatel'nosti predpriyatiya* (uchebnik). Prospekt.
14. Melnik, M. V. (2006). *Teoriya ekonomicheskogo analiza* (uchebnik dlya vuzov). Finansy.
15. Rodionova, V. M. (2005). *Finansovaya ustoychivost' predpriyatiya v usloviyakh inflyatsii*. Perspektiva.
16. Rokhmanova, D. A., & Lyukevich, I. N. (2016). *Problematika metodov otsenki finansovoy ustoychivosti kommercheskogo banka.* V sbornike: Nedelya nauki SPbPU materialy nauchnoy konferentsii s mezhdunarodnym uchastiyem.

Daxil oldu: 18.09.2024
Baxışa göndərildi: 01.10.2024
Təsdiq edildi: 10.10.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2706-6185/40/56-59

**Orxan Məmmədov**
Bakı Biznes Universiteti
magistrant
orxanmemmedov487@gmail.com

# Azərbaycanda sığorta bazarının fəaliyyətinin təhlili

**Xülasə**

Maliyyə sisteminin tərkib hissəsi olan sığorta – bir iqtisadi kateqoriya olaraq, baş verən bu və ya digər xoşagəlməz hallardan, fövqəladə hadisələrdən vurulan ziyanın aradan qaldırılması, vətəndaşların şəxsi həyatları ilə əlaqədar olan hadisələr zamanı onlara maliyyə yardımlarının edilməsi ilə yaradılan məqsədli pul vəsaiti fondlarının yaradılması və istifadəsi prosesidir. Sığorta işinin səmərəli təşкilinin və beynəlxalq standartlar səviyyəsində inкişaf etdirilməsinin ölkə iqtisadiyyatının bazar münasibətləri şəraitində möhkəmlənməsində mühüm iqtisadi əhəmiyyəti vardır. Bu baxımından sığorta fəaliyyətinin həyata keçirilməsində daim nəzarət mövcuddur. Sığorta bazarında fəaliyyət göstərən şirkətlərin fəaliyyətinin qiymətləndirilməsi mütəmadi olaraq dövlətin nəzarətindədir və bu yoxlamanının həyata keçirilməsi birbaşa olaraq Mərkəzi Banka həvalə edilmişdir. Respublikamızın müasir sığortası, maliyyə sisteminin ən önəmli sferalarından biridir. O, istehsalının aşağı düşməsinin qarşısının alınmasında, onun fasiləsizliyinə zəmanət yaradılmasında şübhəsiz əhəmiyyətə malikdir. Sığorta bazarının izlənməsi, orada baş verən hadisə və proseslərin müsbət və ya mənfi dinamikası statistikasız ötüşmür. Bütövlükdə sığorta bazarı və burada əhaliyə göstərilən sığorta xitmətlərinin səviyyə və dinamikasının statistik öyrənilməsi və qiymətləndirilməsi bütün dövrlərdə aktul bir mövzudur.

***Açar sözlər:*** *bazar, sığorta, satış, dinamika, statistika, audit, yoxlama, ekspertiza*

**Orkhan Mammadov**
Baku Business University
Master student
orxanmemmedov487@gmail.com

# Analysis of Insurance Market Activity in Azerbaijan

**Abstract**

Insurance, which is a part of the financial system, is the process of creation and use of targeted cash funds, created as an economic category, by providing financial assistance to citizens during events related to their personal lives, eliminating damage caused by one or other unpleasant situations, emergency events. . Effective organization of insurance work and its development at the level of international standards are of great economic importance in the strengthening of the country's economy in terms of market relations. In this regard, there is constant control over the implementation of insurance activities. The audit evaluation of the activities of the companies operating in the insurance market is regularly under the control of the state, and the implementation of this audit is entrusted directly to the Central Bank. Modern insurance of our republic is one of the most important spheres of the financial system. It is of undoubted importance in preventing the decrease of production and guaranteeing its continuity. Tracking the insurance market, the positive or negative dynamics of the events and processes taking place there is not complete without statistics. The statistical study and evaluation of the insurance market as a whole and the level and dynamics of the insurance services provided to the population is a current topic at all times.

***Keywords:*** *market, insurance, sales, dynamics, statistics, audit, inspection, expertise*

